E-ISSN: 2674-5224

VOLUME 21 ISSUE 10 2022



ISSN: 1609-1620, E-ISSN: 2674-5224

PAHTEI

REFEREED & REVIEWED JOURNAL

## TABLE OF CONTENTS


ISSN: 1609-1620, E-ISSN: 2674-5224
PAHTEI
REFEREED & REVIEWED JOURNAL

E-ISSN: 2674-5224

VOLUME 21 ISSUE 10 2022 04-12

# MUD VOLCANOES IN AZERBAIJAN AS A DANGEROUS AND UNIQUE MANIFESTATION OF OIL AND GAS FACILITIES

**Iftikhar Gasımov**
SOCAR-AQS, Chief Geologist/Subsurface and Geological Director, PhD student.
Email: igasimov@socar-aqs.com

## ABSTRACT

Based on the information of the authors of the scientific research works dedicated to the study of mud volcanoes in the research region, we can note that we conducted a quantitative assessment of the activity of mud volcanoes, using mainly the region of Azerbaijan. The average annual number of mud volcano eruptions is 0.9–1%. We estimate that mud volcano eruption catalogs for those areas are 26% complete, indicating that mud volcano eruptions are quite frequent. In both regions, more than 50% of all recorded eruptions occur within ten years of the last eruption. Analysis of mud volcano eruption catalogs shows that the volume of breccia ejected during an eruption has little to do with how long the mud volcano has been quiescent. Analysis of the potential impact of seismicity on mud volcano activity shows that mud volcano activity affects earthquakes by 4% and 7%, respectively.
Mud volcanoes are often found in areas where large oil and gas fields are located, posing a threat to oil and gas production facilities. Eruptions of mud volcanoes occur frequently and the area of impact can reach several kilometers. Quantitative analysis of mud volcano activity using Azerbaijan, Absheron and Baku archipelagos as examples shows that the annual average number of eruptions in these regions is 3.62 and 1.45, respectively. The time intervals between eruptions of each volcano vary greatly. However, more than 50% of all mud volcano eruptions in both regions occur in the first decade after the previous eruption. An analysis of the eruption catalogs for the Absheron and Baku archipelagos shows that the volume of sedimentary rocks ejected by the eruptions is not really related to the period when the mud volcanoes were quiescent. During more than two centuries of observations, all volumes and sizes of emissions from thousands of cubic meters to millions of cubic meters were recorded in the Absheron and Baku archipelagos in the Azerbaijan region after all kinds of quiet periods (from one year to decades). Seismic events can affect mud volcanic activity, which acts as a trigger. At the same time, this effect is not the main factor in the eruption of mud volcanoes; eruptions without any previous earthquake are more common. Our calculations show that 6% and 8% of all potential cases of mud volcanoes in the Azerbaijan region react to earthquakes, respectively. Since catalogs of mud volcano eruptions are incomplete, we can assume that the actual reaction probability may be twice that. Oil and gas production is projected and exploited in many fields (onshore and offshore) near mud volcanoes.
Excavations carried out in volcanic zones in Azerbaijan yielded extensive and very interesting information about both underwater and surface muds, volcanoes and their short-term manifestations, which are both present in the modern development activity. In the geological cross-sections of the drilled wells, the presence of strong eruption products of mud volcanoes in sedimentary rocks of different ages was given, which indicates the active activity of mud volcanoes in different geological periods. As noted by P.P. Rahmanov, solid mud volcanic eruption products covered with young sediments during the sedimentation process were




discovered for the first time during industrial drilling in the Bibiheybat area of the Absheron Peninsula.
However, a number of researchers have attempted to determine the volume of gas released during eruptions. Various methods have been proposed to determine gas consumption, based on the amount of gas burned, the volume of gas collected in the mud volcano vent between eruptions, the flow rate, diameter, pressure, and duration in wells, taking into account the similarity to an open gas fountain. Researchers estimate the amount of gas rising into the atmosphere during an eruption in different ways: from (0.5-1.0)·103, to (20-40)·103, 100-500, 20-500, 400, 300, 3-4 mln.m3 . A more realistic number can be determined by dividing mud volcano eruptions into strong, medium and weak degrees of intensity.
**Keywords:** Mud volcano, seismic, extrapolation, earthquake, flowing, emission, eruption, field.

## AZƏRBAYCANDA PALÇIQ VULKANLARININ NEFT VƏ QAZ OBYEKTLƏRINƏ TƏHLÜKƏLI VƏ UNIKAL TƏZAHÜRÜ KIMI

**İftixar Qasımov**
Baş Geoloq/Yeraltı və Geoloji Əməliyyatlar üzrə direktoru, doktorant, SOCAR-AQS
Email: igasimov@socar-aqs.com

### XÜLASƏ

Tədqiqat rayonu palçıq vulkanlarının öyrənilməsinə həsr edilmiş elmi-tədqiqat işləri müəlliflərinin məlumatlarına əsaslanaraq qeyd edə bilərik kı, palçıq vulkanları əsasən Azərbaycan bölgəsini istifadə edərək, palçıq vulkanlarının fəaliyyətinin kəmiyyət qiymətləndirəsini apardıq. Palçıq vulkanlarının püskürmələrinin orta illik sayı 0.9–1 % təşkil edir. Həmin ərazilər üçün palçıq vulkanı püskürmələrinin kataloqlarının 26 % tamamlandığını təxmin edirik, müvafiq olaraq palçıq vulkanlarının püskürməsi olduqca tez-tez baş verir. Hər iki bölgədə qeydə alınan bütün püskürmələrin 50%-dən çoxu son püskürmədən sonra on il ərzində baş verir.
**Açar sözlər:** palçıq vulkanı, seysmik, ekstrapolyasiya, zəlzələ, təzahür, emissiya, püskürmə, yataq.

### Giriş

Azərbaycan bölgəsində palçıq vulkanı püskürmələri kataloqlarının təhlili göstərir ki, püskürmə zamanı atılan brekçiyaların həcmi palçıq vulkanının nə qədər müddət ərzində sakit olması ilə praktiki olaraq əlaqəli deyil. Seysmikliyin palçıq vulkanı fəaliyyətinə potensial təsirinin təhlili göstərir ki, palçıq vulkanlarının fəaliyyəti zəlzələlərə müvafiq olaraq 4 % və 7 % təsir edir.
Azərbaycan ərazisi palçıq vulkanların geniş yayıldığı ölkələrdən biri sayılır.




**Şəkil 1.** Azərbaycanın palçıq vulkanlarının yerləşmə xəritəsi. Palçıq vulkanlari: a, b – müəyyən (a) və güman edilən (b).

Palçıq vulkanları özlərinə məxsus bir çox xüsusiyyətləri (morfologiya, tutduqları sahələr, püskürmə məhsullarının həcmi, süxur hissəciklərinin yaş və tərkibləri) ilə yanaşı, təzahürlərinə görə də bir-birlərindən fərqlənirlər. Azərbaycanda palçıq vulkanizminin bütün təzahür formalarına (aktiv fəaliyyətli, sönmüş, basdırılmış, sualtı, ada və bol neft nişanələri) rast gəlinir kı, onlardan da yalnız sonuncuların sayı 40-dan artıqdır.

Palçıq vulkanlarına tez-tez iri neft və qaz yataqları olan ərazilərdə rast gəlinir. Palçıq vulkanizminə bəzən ərazidə karbohidrogenlərin mövcudluğunu göstərən əlamətlərdən biri kimi baxılır [1]. Palçıq vulkanizmi mühəndis infrastrukturu və təbii ekosistemlər üçün ciddi təhlükə yaradan təhlükəli geoloji hadisədir və onun ciddi sosial-iqtisadi və ekoloji fəsadları ola bilər

Sənaye əhəmiyyətli neft və qaz obyektlərinə ziyan vurmaqla yanaşı, quruda və dənizdə böyük neft sızması riski var. Bu cür dağılmalara cavab bütün əməliyyat məsrəflərindən baha başa gələ bilər [2]. Neft şirkətləri potensial əməliyyat sahələrində təhlükəsizliyə çox diqqət yetirirlər. Məhz, onlar mineral ehtiyatların hasilatı sahələrində ən təhlükəli zonaları, habelə potensial fövqəladə halların əhatə dairəsini müəyyən etməlidirlər. Ona görə də neft və qaz yataqlarının işlənilməsinin hər bir mərhələsində palçıq vulkanlarının müəyyən edilməsi, monitorinqi və tədqiqi üçün kompleks tədbirlər həyata keçirilməlidir. Bu, mümkün fövqəladə halları proqnozlaşdırmaq və nəticələrin qarşısını almaq üçün lazımdır. Dənizdə neft və qaz yataqlarının işlənilməsi zamanı bu vəzifələr çətinləşir, çünki sualtı palçıq vulkanları tapmaq qurudakılardan daha çətindir. Bu hallarda biz maye dinamik sistemlərinin qeydiyyatı və öyrənilməsi üçün müxtəlif üsullardan istifadə edə bilərik [5,7]. Göründüyü kimi, palçıq vulkanı fəaliyyətinin geoloji risklərinin təhlili palçıq vulkanlarının püskürmələrinin kəmiyyət qanunauyğunluqlarını bilməyi tələb edir.

**Məqsəd**

Palçıq vulkanlarının püskürmə fəaliyyətinin statistik təhlili nümunə kimi Azərbaycan bölgəsindən istifadə etməklə aparılmışdır. Azərbaycan Yer kürəsinin ən böyük palçıq vulkanı əyalətidir (350-




dən çox vulkan) [1]. 1810-2019-ci ilə qədər olan məlumatlarla yenilənmiş Azərbaycan üçün palçıq vulkanlarının püskürmələrinin kifayət qədər müfəssəl kataloqu mövcuddur. Nəticədə əldə edilən məlumat bazası 93 vulkanın 420-dən çox püskürməsi haqqında məlumatı ehtiva edir. Ümumi püskürmələrin sayından, 23 vulkan-1 dəfə, 39 vulkan-5 dəfə, 24 vulkan-5 dən 10-a qədər və cəmi 7 vulkan-10 dəfədən çox püskürub. Seysmikliyin palçıq vulkanı fəaliyyətinə necə təsir etdiyini öyrənmək üçün püskürmələrin və zəlzələlərin kataloqlarının birgə təhlilini apardıq. Dəqiq və etibarlı kəmiyyət qiymətləndirməsi yalnız nümayəndəli verilənlər toplusu ilə mümkündür. Aydındır ki, istifadə olunan palçıq vulkanlarının püskürmə kataloqları müntəzəm müşahidələr aparılmadığından (xüsusilə 20-ci əsrin ortalarına qədər) natamamdır. Bir püskürməni qaçırma şansı onun gücündən asılıdır. Güclü püskürmənin qeydə alınmaması ehtimalı daha aşağıdır. Palçıq vulkanı yaşayış məntəqəsinə yaxın olarsa, püskürmənin diqqətdən kənarda qalma ehtimalı da çox yüksək deyil [4]. Buna görə də palçıq vulkanları kataloqlarının tam olması öz əhəmiyyətinə malikdir və bundan sonra ayrıca müzakirə ediləcəkdir.
Azərbaycanın ayrı-ayrı rayonları üzrə palçıq vulkanlarının kəmiyyətcə paylanması aşağı cədvəldə verilmişdir.

Cədvəl 1.

| Rayonlar Tiplər | Palçıq vulkanları | Palçıq vulkanı təzahürləri | Ümumi sayı |
|---|---|---|---|
| Xəzəryanı-Quba | 2 | 5 | 7 |
| Şamaxı-Qobustan: | 86 | 34 | 120 |
| 1. Şamaxı zonası | 6 | 10 | 16 |
| 2. Şimali Qobustan zonası | 9 | 12 | 21 |
| 3. Mərkəzi Qobustan zonası | 28 | 10 | 38 |
| 4. Cənubi Qobustan zonası | 43 | 2 | 45 |
| Abşeron: | 45 | 24 | 69 |
| 1. Abşeron yarımadası | 30 | 9 | 39 |
| 2. Abşeron arxipelaqı | 17 | 13 | 30 |
| Aşağı Kür | 25 | 8 | 33 |
| Cənubi Xəzər: | 117 | 7 | 124 |
| 1. Baki arxipelaqı | 85 | 7 | 92 |
| 2. Cənubi Xəzərin dərinsu hissəsi | 32 | - | 32 |
| Cəmi: | 277 | 76 | 353 |

**Metodlar**
Hal-hazırda Yer kürəsində 2500-dən çox palçıq vulkanı aşkar edilmişdir ki, onlardan da 1400-dən çoxu dənizdədir. Ən böyük vulkanlar və ən güclü püskürmələr neft və qaz ərazilərində yerləşən palçıq vulkanları üçün xarakterikdir [1]. Son illərdə insanlar Arktika regionunu fəal şəkildə araşdırır və bu istiqamətdə işlərini inkişaf etdirirlər, araşdırmaların nəticələrinə görə region neft və qaz hasilatı baxımından perspektivlidir. Hazırda Arktikada Norveç və Şpitsbergen sahilləri arasında Haakon Mosby adlı bir sualtı palçıq vulkanı məlumdur [7]. Müəyyən geoloji şərait bizi Arktikada daha çox palçıq vulkanının olduğunu düşünməyə vadar edir.
Saxalin adasının şimal-şərqində dəniz neft və qaz yataqları fəal şəkildə işlənir. Burada Dağı palçıq vulkanının yaxınlığında yerləşən Piltun-Astoxskoye, Dağı və Çayvo yataqları xüsusi maraq

doğurur [6]. Qara dənizdə və Azov dənizində çoxlu palçıq vulkanları aşkar edilmişdir. Kerç boğazında palçıq vulkanlarının sayı artıb. Naviqasiya təhlükəsizliyini təmin edərkən bunu nəzərə almaq lazımdır, çünki Kerç boğazından hər il 10000-ə qədər dəniz gəmisi keçir [6]. Azərbaycan həm də quruda və dənizdə çoxsaylı palçıq vulkanlarına yaxın neft və qaz yataqlarını fəal şəkildə işlədir [1]. Əsas təhlükələr palçıq sürüşmələri, qaz emissiyaları, metanın öz-özünə yanması və deformasiyalardır.

Çox vaxt quyuların qazılması yanan metanla təsadüfi qaz boşalması ilə müşayiət olunur. Sualtı palçıq vulkanlarının püskürməsi nəticəsində yaranan adalar və qum sahilləri dənizlər üçün əsas təhlükədir. Sualtı palçıq vulkanlarından güclü tək qaz püskürmələri də təhlükəlidir, çünki onlar suyun sıxlığının dəyişməsi səbəbindən gəminin kəskin sürüşməsinə və çevrilməsinə səbəb ola bilər. 1953-cü ildə sualtı palçıq vulkanından çıxan qaz partlayışı Yaponiyanın elmi gəmisi olan Kayo Maru 5-in batmasına və 31 nəfərin ölümünə səbəb oldu [3]. Palçıq vulkanlarının növlərindən biri palçıq diapirləri, mərkəzi hissədə özəyi elastik gillərdən ibarət qübbəli pirsinq strukturlarıdır. Həmin gillər yuxarıya doğru itələnir, yuxarı qalxır, sındırılır və üstündəki qayanın içindən keçir. Diapirin nüvəsi həmişə olmasa da əksər hallarda yer səthinə çatır. Fiziki modelləşdirmə göstərir ki, üzərindəki süxur nə qədər qalın olarsa (palçıq vulkanının ürəyi nə qədər dərin olarsa), yeraltı mayelərin səthə miqrasiyası üçün bir o qədər çox təzyiq tələb olunur. Təzyiq kifayət etməsəydi, palçıq vulkanının əvəzinə səthə çıxmayan palçıq diapiri ilə nəticələnə bilərik. Dənizin dibinə çatmayan palçıq diapirlərinə də kor palçıq vulkanları deyilir ki, bu cür təbii obyektləri tapmağın nə qədər çətin olduğunu göstərir. Bununla belə, palçıq diapirləri insanların iqtisadi fəaliyyəti üçün potensial təhlükədir. Palçıq diapiri sahəsində qazma işləri güclü püskürmə şəklində yeni palçıq vulkanının yaranmasına səbəb ola bilər. Palçıq vulkanları da güclü zəlzələlər nəticəsində aktivləşə bilər. Zəlzələlər vulkan püskürmələrinin potensial təkanvericisi kimi hesab olunur. Azərbaycan bölgəsi üzrə palçıq vulkanı püskürmələri kataloqlarının təhlili bəzi qanunauyğunluqları aşkar edib (1946-cı ildən indiyədək). Azərbaycanda ildə 3–4 palçıq vulkanı püskürür (orta qiymət 3.62). 1946-cı ilə qədər palçıq vulkanlarının püskürmələrinin illik orta sayı əhəmiyyətli dərəcədə aşağı idi–0.35-dən (1810-1846) 1.89-a (1900-1946). Güman edirik ki, əsas səbəb o zaman palçıq vulkanlarının müntəzəm monitorinqi aparılmadığından bəzi püskürmələrin qeydə alınmamasıdır. Əks halda, palçıq vulkanı püskürmələrinin intensivliyinin iki əsr ərzində bir neçə dəfə artdığına inanmalı olardıq. Bu müddət geoloji zaman üçün çox qısadır ki, uzun geoloji proseslərin əhəmiyyətli dərəcədə artması baş verə bilər. Çox güman ki, 1946-cı ilə qədər Azərbaycanda ildə eyni 3–4 püskürmə baş verirdi. Biz Azərbaycanın palçıq vulkanı püskürmələri kataloqunun tamlığını 52 % kimi qiymətləndiririk.

Azərbaycanda vulkanik zonalarda aparılmış qazma işləri əsasında müasir dövrdə fəaliyyətdə olan həm sualtı, həm də yerüstü palçıq vulkanları və onların şiddətli təzahürləri haqqında geniş və çox maraqlı məlumatlar əldə edilmişdir. Qazılmış quyuların geoloji kəsilişlərində müxtəlif yaşlı çökmə süxurlarda palçıq vulkanlarına aid bərk püskürmə məhsullarının iştirak etdiyi müəyyən edilmişdir ki, bu faktlar da müxtəlif geoloji dövrlərdə palçıq vulkanlarının aktiv fəaliyyətdə olduqlarını göstərən əyani sübutlardır. P.P.Rəhmanovun qeyd etdiyi kimi, sedimentasiya prosesi zamanı cavan yaşlı çöküntülərlə örtülmüş bərk palçıq vulkanik püskürmə məhsulları ilk dəfə Abşeron yarımadasının Bibiheybət sahəsində aparılan qazma işləri zamanı aşkar edilmişdir.

Bununla belə, bir sıra tədqiqatçılar püskürmələr zamanı ayrılan qazın həcmini təyin etməyə cəhd etmişlər. Qazın sərfini müəyyən etmək üçün müxtəlif üsullar təklif olununb, yanan qazın miqdarına, püskürmələr arası müddətdə palçıq vulkanı ocağında toplanan qazın həcminə, debiti, diametri, təzyiqi və davamlığını nəzərə almaqla quyularda açıq qaz fontanı ilə oxşarlığına görə.




Bir püskürmə zamanı atmosferə qalxan qazın miqdarını tədqiqatçlar müxtəlif qiymətləndirirlər: (0.5-1.0)·$10^3$-dən, (20-40)·$10^3$-ə qədər, 100-500, 20-500, 400, 300, 3-4 mln.$m^3$. Həqiqətə daha uyğun rəqəmi palçıq vulkanı püskürmələrini intesivliyinə görə güclü, orta və zəif dərəcələr ayırmaqla müəyyən etmək olar. Dərəcələrin təyinində əsas göstərici kimi qazın və brekçiyanın həcmi, axın dillərinin uzunluğu və çatların ölçüsü nəzərə alınmışdır (cədvəl 2).

**Cədvəl 2.** Palçıq vulkanlarının püskürmə dərəcələrinin səciyyəsi.

| Püskürmə dərəcəsi | Alovun hündürlüyü,m | Qazın həcmi, mln.m3 | Brekçiya örtüyünün sahəsi, min m2 | Axın dilinin uzunluğu, m | Brekçiyanın həcmi, min m3 | Çatların uzunluğu, m |
|---|---|---|---|---|---|---|
| Güclü | >100 | 30-200 (orta 100) | >20 | >100 | 100-200 (orta 150) | >500 |
| Orta | 50-100 (orta 75) | 5-30 (orta 20) | 0,5-20 (orta 10) | 50-100 (orta 75) | 50-100 (orta 75) | 100-500 (orta 300) |
| Zəif | < 50 | <5 (orta 2) | < 0,5 | <50 | <50 (orta 20) | <100 |

Biz Azərbaycanda palçıq vulkanlarının püskürmələri zamanı atılan çöküntü süxurlarının həcmi ilə müəyyən həcmdə boşalma ilə qeydə alınmış püskürmələrin sayı arasında əlaqəni təhlil etdik (şəkil 1). Güclü və orta püskürmə zonalarında püskürmələrin həcminin qeydi azalarkən, püskürmələrin sayının artması istiqamətində aydın xətti tendensiya görürük. Ancaq zəif püskürmələrə gəldikdə, püskürmələrin sayında kəskin azalma görürük. Çox güman ki, zəif püskürmələr güclü olanlardan daha çoxdur. Bunun ehtimal səbəbi bir çox püskürmələrin qeydə alınmamasıdır. Yaranan xətti tendensiyanı zəif püskürmələrə ekstrapolyasiya etsək, qeydə alınmayan püskürmələrin sayını, həmçinin palçığın ümumi həcmini təxmin edə bilərik.
Seçilmiş dövr ərzində vulkan emissiyaları.




**Şəkil 2.** Azərbaycanda Palçıq vulkanlarının qeydə alınmış püskürmələrinin sayı ilə atılan çöküntü süxurlarının həcmi arasında əlaqə: a – Quru, b – Dəniz bölgəsi. Sağ miqyasda atılan çöküntü süxurlarının müəyyən həcminin püskürmələrinin sayı göstərilir. Sol miqyas qeyd olunan püskürmələrin ümumi sayından müəyyən bir həcmdə püskürmə faizini göstərir

Aktiv palçıq vulkanları maqma vulkanları qədər dağıdıcı deyil, lakin onlar daha tez-tez püskürürlər. Hər palçıq vulkanının püskürmələri arasındakı vaxt intervalları çox dəyişir. Bununla belə, istər Azərbaycanda, Abşeron və Bakı arxipeloqlarında biz ümumi tendensiyanın şahidi

ISSN: 1609-1620, E-ISSN: 2674-5224
P A H T E I
REFEREED & REVIEWED JOURNAL
E-ISSN: 2674-5224
VOLUME 21 ISSUE 10 2022

olduq: sakit vaxtda palçıq vulkanları artır, püskürmələrin sayında sürətli azalma var. Hər iki regionda qeydə alınan bütün püskürmələrin 51-54 %-i palçıq vulkanları sakitləşdikdən sonra ilk onillikdə baş verir. Qeyd etmək lazımdır ki, bəhs etdiyimiz qeydə alınmamış püskürmələr, püskürmələr arasındakı müddətləri uzadır və bununla da uzun sakit dövrlə püskürmələrin payını artırır. Palçıq vulkanlarının təsir sahəsi püskürmə mərkəzindən 4–5 kilometrə qədər uzağa gedə bilər. Məsələn, püskürmə zamanı çoxlu çöküntü qayaları atılır. Gözləyə bilərik ki, aktiv vulkan nə qədər uzun müddət sakit qalırsa, onun növbəti püskürməsində bir o qədər çox emissiya gözləyə bilərik. Lakin mövcud məlumatlar bu nəzəriyyəni dəstəkləmir. İki əsrdən çox davam edən müşahidələr zamanı Azərbaycanda, Quru və dəniz sahələri hər cür sakit dövrlərdən (bir ildən onilliklərə qədər) sonra minlərlə kubmetrdən milyonlarla kubmetrədək emissiyaların bütün həcmləri və ölçüləri qeydə alınmışdır (şəkil 2). Əvvəlki püskürməsindən cəmi bir il sonra palçıq vulkanının uzun illər sakit qaldıqdan sonra daha çox brekçiya atdığı və hadisələrin əksinə getdiyi bir çox hallar mövcuddur.




**Şəkil 3.** Azərbaycanda, quru (1) və dəniz (2) palçıq vulkanlarının püskürmələri zamanı atılan brekçiyaların həcmi ilə sonuncu püskürmədən keçən vaxt intervalı arasında aslılıq.

Palçıq vulkanlarının fəaliyyəti zəlzələlərə görə dəyişə bilər. Palçıq vulkanlarının ən sürətli reaksiyası onu hərəkətə keçirən zəlzələ ilə eyni gündə olub. Eyni zamanda, püskürmələrin seysmik hadisədən cəmi iki və ya üç il sonra baş verdiyi hallar var. Müxtəlif maye dinamik sistemlərinə, o cümlədən palçıq vulkanlarına seysmik təsirin həddi qiymətlərinin kəmiyyət qiymətləndirmələri mövcuddur. Aşağıdakı düstur olduqca yayğındır:

$$\log R_{max} = 2{,}05(\pm 0{,}10) + 0{,}45M$$

burada M zəlzələnin maqnitudasıdır, Rmax episentrin tətik effektinin müşahidə oluna biləcəyi maye dinamik sistemindən maksimum məsafəsidir. Düsturdakı R dəyəri metrlə təqdim olunur. Bu düsturla biz Azərbaycanda zəlzələlərə potensial reaksiya verən palçıq vulkanlarının hallarını müəyyən etdik. Hesablamalarımız göstərir ki, Azərbaycanda 1810-2018-ci illərdə baş vermiş



ISSN: 1609-1620, E-ISSN: 2674-5224
P A H T E I
REFEREED & REVIEWED JOURNAL

zəlzələlər 5 palçıq vulkanının püskürməsinə səbəb olmalı idi. Əslində, 35 püskürmə qeydə alınmışdır, buna görə də halların yalnız 6 % - i Palçıq vulkanı idi.
Zəlzələdən sonra iki il ərzində baş verərsə, zəlzələyə reaksiya vermiş sayılır. Palçıq vulkanları adətən tez-tez püskürdüyü üçün daha uzun vaxt intervallarından istifadə etmək məqsədəuyğun deyil. Buna görə də, zəlzələlərdən asılı olmayaraq, daha uzun bir zaman intervalında palçıq vulkanları təbii səbəblərdən püskürəcək. Palçıq vulkanlarının zəlzələlərə anomal reaksiyası hallarının olduğunu qeyd etməliyik. Məsələn, 2000-ci il noyabrın 25-də baş vermiş zəlzələdən sonra (M = 6.4) Azərbaycanda potensial 84-dən 19-u palçıq vulkanı püskürməsi qeydə alınmışdır.
Palçıq vulkanlarının zəlzələyə reaksiya vermə ehtimalı təxminən 23% təşkil etmişdir. Bu anomaliyanı verilənlər bazamızdan çıxarsaq, Azərbaycan palçıq vulkanlarının zəlzələyə reaksiya vermə ehtimalı cəmi 3% olacaq.

**Nəticə**

Palçıq vulkanlarına tez-tez iri neft və qaz yataqlarının yerləşdiyi ərazilərdə rast gəlinir ki, bu da neft və qaz hasilatı obyektləri üçün təhlükə yaradır. Palçıq vulkanlarının püskürmələri tez-tez baş verir və təsir sahəsi bir neçə kilometrə çata bilər.
Nümunə kimi Azərbaycanın quru və dəniz sahələrindən istifadə etməklə palçıq vulkanlarının fəaliyyətinin kəmiyyət təhlili göstərir ki, bu bölgələrdə püskürmələrin illik orta sayı müvafiq olaraq 3.62 və 1.45-dir. Hər bir vulkanın püskürmələri arasındakı vaxt intervalları çox dəyişir. Bununla belə, hər iki regionda bütün palçıq vulkanlarının püskürmələrinin 50 %-dən çoxu əvvəlki püskürmədən sonrakı ilk onillikdə baş verir. Quru və dəniz sahələri üzrə püskürmələr kataloqlarının təhlili göstərir ki, püskürmələr nəticəsində atılan çöküntü süxurlarının həcmi palçıq vulkanlarının sakit olduğu dövrlə həqiqətən də əlaqəli deyil. İki əsrdən çox davam edən müşahidələr zamanı Azərbaycan bölgəsində quru və dəniz sahələri üzrə hər cür sakit dövrlərdən (bir ildən onilliklərə qədər) sonra minlərlə kubmetrdən milyonlarla kubmetrədək emissiyaların bütün həcmləri və ölçüləri qeydə alınıb. Seysmik hadisələr tətik rolunu oynayan palçıq vulkanik fəaliyyətinə təsir göstərə bilər. Eyni zamanda, bu təsir palçıq vulkanlarının püskürməsinin əsas faktoru deyil; heç bir əvvəlki zəlzələ olmadan püskürmələr daha çox yayılmışdır. Hesablamalarımız göstərir ki, Azərbaycan bölgəsində palçıq vulkanlarının bütün potensial hallarının müvafiq olaraq 6 % və 8 %-də zəlzələlərə reaksiya verir. Palçıq vulkanı püskürmələrinin kataloqları tam olmadığı üçün biz ehtimal edə bilərik ki, faktiki reaksiya ehtimalı bundan iki dəfə çox ola bilər.
Neft və qaz hasilatı bir çox yataqlarda (quruda və dənizdə) palçıq vulkanlarının yaxınlığında layihələndirilir və istismar edilir

**ƏDƏBİYYAT**

1. Aliev A.A., Rakhmanov R.R. Mud volcanism. Baku, -Nafta-Press.-2018-, p 328
2. Aliev A A, Guliev I S, Dadashev F G and Rakhmanov R R Atlas of the World's Mud Volcanoes ed Ak A Alizadeh and A D Ismailzade -Baku: Nafta-Press, 2015- p 322
3. Bogoyavlensky V I and Bogoyavlensky I V. Proc. of the State Oceanographic Institute.- 2017. 218,- pp 191–210
4. Bogoyavlensky V. I., Bogoyavlensky I. V. and Kargina T. N. J. Drilling and Oil.- 2017
5. Glazyrin E A Modern Problems of Geology, Geophysics and Geoecology of the North Caucasus ed I A Kerimov (Moscow: IHNST RAS) 7 chapter 2, 2017- pp 39–48


ISSN: 1609-1620, E-ISSN: 2674-5224
PAHTEI
REFEREED & REVIEWED JOURNAL

E-ISSN: 2674-5224

VOLUME 21 ISSUE 10 2022

6. Shnyukov E. F. and Maslakov N. A. Geol. and Min. Res. of the World Ocean 2.- 2009- pp 81–91
7. Bondur V. G .and Kuznetsova T. V. Earth and Space Exploration 4.- 2015.- pp 30–43

# ГРЯЗЕВЫЕ ВУЛКАНЫ В АЗЕРБАЙДЖАНЕ КАК ОПАСНОЕ И УНИКАЛЬНОЕ ПРОЯВЛЕНИЕ НЕФТЕГАЗОВОГО КОМПЛЕКСА

**Ифтихар Гасымов**
SOCAR-AQS, главный геолог, директор по эксплуатации недр и геологическим работам, докторант.
Email: igasimov@socar-aqs.com

## РЕЗЮМЕ

Опираясь на информацию авторов научно-исследовательских работ, посвященных изучению грязевых вулканов в районе исследований, можно отметить, что мы провели количественную оценку активности грязевых вулканов, используя в основном регион Азербайджана. Среднегодовое количество извержений грязевых вулканов составляет 0,9–1 %. По нашим оценкам, каталоги извержений грязевых вулканов для этих районов заполнены на 26%, что указывает на довольно частые извержения грязевых вулканов. В обоих регионах более 50% всех зарегистрированных извержений происходят в течение десяти лет после последнего извержения. Анализ каталогов извержений грязевых вулканов показывает, что объем брекчии, выброшенной во время извержения, имеет мало общего с тем, как долго грязевой вулкан находится в состоянии покоя.
**Ключевые слова:** Грязевой вулкан, сейсмика, экстраполяция, землетрясение, фонтан, эмиссия, извержение, залежь.

Publication history

Article received: 26.09.2022
Article accepted: 04.10.2022
Article published online: 22.10.2022
DOI suffix: 10.36962/PAHTEI21102022-04

E-ISSN: 2674-5224
13-19 VOLUME 21 ISSUE 10 2022

ISSN: 1609-1620, E-ISSN: 2674-5224
P A H T E I
REFEREED & REVIEWED JOURNAL

# DEVELOPMENT OF SIMULATED AND AUTOMATED CONTROL SYSTEM FOR CONSTRUCTION SAND PREPARATION TECHNOLOGY

**[1]Almaz Mehdiyeva, [2]Jasarat Jamalov, [3]Nurana Allahverdiyeva**
[1]Associate professor, https://orcid.org/0000-0002-3962-3980
Email: almaz.mehdiyeva@asoiu.edu.az
[2]Associate professor, Email: cesaret.camalov@gmail.com
[3]PhD student, Email: nuru15@rambler.ru
[1,3]Department of "Electronics and Automation"
[1,3]Azerbaijan State Oil and Industry University
[2]Azerbaijan Research Institute of Construction and Architecture

## ABSTRACT

It is known that sand is a natural raw material and has irreplaceable properties. The sand used for construction works is divided into the following types: Material from natural sand-sand quarries and sand-gravel deposits; Wrought sand - a material obtained by beating gravel and rock fragments; Fragmented sand - a material artificially divided into two or more fractions; Sand from the remains of forging - a material obtained from the remains of rock fragments in the production of gravel.

Thus, sand has a very wide range of uses. However, as with all other natural raw materials, sand contains a mixture of clay, silt and dust particles in excess of the norm. For this reason, the sand must be cleaned of impurities before use. This process is called sand washing and is performed in different ways. There are many sand washing machines in the world, but it is still not possible to buy new completely clean and cost-effective sand. We have proposed a new approach to sand washing. A device for carrying out the washing process has been proposed and a preliminary sample has been prepared. As we have achieved the results of the proposed device at the initial stage, the issue of automation was considered at the next stage.

In order to model a hand-operated device in the laboratory to obtain sufficiently clean sand, a scheme was first drawn in Autocad.

Various computational effects on the geometric properties of the structure and the mechanical properties of the materials during the specified long period of time to meet the longevity requirements (taking into account the long-term effects of the load, unfavourable climate, aggressive effects, technological temperature and humidity, freezing to meet the requirements for suitability for operation and safety and thaw, etc.). There are safety, serviceability, longevity and other requirements set by the project assignment for concrete and reinforced concrete structures. Among them: - requirements for concrete and its components; - requirements for fittings; - design calculation requirements; - constructive requirements; - technological requirements; - operational requirements. These requirements must be met.

Design reliability of concrete and reinforced concrete structures AZDTN 2.16-1 “Concrete and reinforced concrete structures” design norms using calculated values of loads and impacts, calculation characteristics of concrete and reinforcement (or structural steel) taking into account the level of responsibility of buildings and structures and is determined by the semi-probability method in accordance with DUIST 27751. Ensuring the long-term normal operation of buildings and facilities is one of the most important issues in all countries, regardless of the political system, and is still a pressing issue. Just as everything that exists in nature is in

development and dynamics, so it is an objective fact that buildings and engineering structures, which are the product of human activity, are subject to objective changes and damage due to a number of factors. Improving the quality of reinforced concrete structures is primarily due to factors such as reliability, longevity, which is of great practical importance during the long-term operation of buildings and structures. The building and installation are considered reliable only if the requirements of the project are met during operation, i.e. the main load-bearing structures of the building have the necessary strength, rigidity, as well as its durability. In this case, the building will also meet the condition of longevity. Inert materials (sand, gravel, crushed stone, etc.), which are considered important in construction work, provide the composition of building materials, products and structures. The conducted studies are of great scientific and practical importance in the direction of eliminating shortcomings. Thus, the proposed method fully allows you to wash and clean the resulting sand from dust, particles of clay and silt. The installation and use of such a treatment plant at sand mining enterprises is considered relevant today. The solution is to achieve clean, high quality, break-even sand washing and a new sand washing device to reduce operating costs.
**Keywords**. sand washing, grains of sand, dirty sand, dusty clay mixtures, sand production, construction sand.

# İNŞAAT QUMUNUN HAZIRLANMA TEXNOLOGİYASININ MODELLƏŞDİRİLMİŞ VƏ AVTOMATLAŞDIRILMIŞ İDARƏETMƏ SİSTEMİNİN İŞLƏNMƏSİ

**[1]Almaz Mehdiyeva, [2]Cəsarət Camalov, [3]Nuranə Allahverdiyeva**
[1]dosent, https://orcid.org/0000-0002-3962-3980, Email: almaz.mehdiyeva@asoiu.edu.az,
[2] t.e.d., dosent, cesaret.camalov@gmail.com,
[3]doktorant, Email: nuru15@rambler.ru
[1 3]"Elektronika və avtomatika" kafedrası
[1,3]Azərbaycan Dövlət Neft və Sənaye Universiteti
[2]Azərbaycan İnşaat və Memarlıq ETİ

## XÜLASƏ

Tikinti işlərində vacib hesab edilən inert materialları (qum, çınqıl, qırmadaş və s.) inşaat materiallarının, məmulatlarının və konstruksiyalarının tərkib nöqteyi nəzərdən əsasını təşkil edir. Aparılan tədqiqatlar çatışmamazlıqların aradan qaldırılması istiqamətində vacib elmi-praktiki əhəmiyyət kəsb edir. Belə ki, təklif olunan üsul istehsal olunan qumun yuyularaq toz, gil və lil hissəciklərindən təmizlənməsinə tam imkan verir. Belə bir təmizləyici qurğunun qum istehsal edən müəssisələrdə quraşdırılması və istifadə edilməsi bu gün üçün aktual hesab olunur. Məsələnin həllinə qumun təmiz, keyfiyyətli, itkisiz yuyulması və istismar xərclərinin azaldılması üçün yeni qumyuyan qurğu ilə nail olmaqdır.
**Açar sözlər:** qumyuyucu, qum dənəcikləri, çirkli qum, toz-gil qarışıqları, qum istehsalı, inşaat qumu.





**Giriş**

Müasir dövrdə hər bir dövlətin qarşısında duran başlıca vəzifələrdən biri ölkə vətəndaşlarının yaşayış səviyyəsini daha da yüksəltmək, mənzil tikintisini genişləndirmək, mədəniyyət, təhsil, səhiyyə işini inkişaf etdirməkdir. Bunun üçün Elmi-Texniki Tərəqqinin nailiyyətlərindən yararlanmaqla tikinti sənayesinin material-texniki əsasını gücləndirmək tələb olunur. Hazırda tikinti sektorunda yenidənqurma işlərində yerli tikinti materiallarından istifadə ön plana çəkilir. Məhz bu amil regionlarda tikinti-quraşdırma işləri aparılan zaman tikinti materialları sənayesinin inkişafına səbəb olur [1-4]. Belə ki, Belə materiallardan olan qum, sadəliyinə baxmayaraq, insan fəaliyyətində mühüm yer tutur. İstər kiçik və istərsə də böyük həcmli tikinti işlərində qumdan istifadə edilir. Belə ki, qumdan müxtəlif tikinti qarışıqlarının (beton, asfalt, suvaq, müxtəlif dekorativ örtüklər və s.), dəmir-beton konstruksiyaların yaradılmasında və həmçinin, qum şırnağı ilə işlənilmədə və doldurma işlərində, şüşə, silikat və klassik gil kərpic istehsalı üçün bir komponent kimi geniş istifadə olunur.

**Məqsəd**

Mövcud (ənənəvi) üsullar ilə qumu təmizlədikdə qumun tərkibində olan gil hissəciklərinin tam təmizlənməsi üçün təkrar-təkrar yuyulması tələb olunur [5-8]. Bu zaman məhsuldarlıq azalır və qurğuların idarə edilməsi üçün daha artıq enerji sərf olunur. Belə qurğularda xırda qumun (kiçik ölçülü 0,16 – 0,63 mm) miqdarı 20% qədər olduğu üçün məhsuldarlığın aşağı düşməsi ilə yanaşı, həm də qumun qranolometrik tərkibinə ciddi təsir edir. Bu halda xırda qum çox itirilir, eyni zamanda ətraf mühitin çirklənməsinə səbəb olur. Göstərilən çatışmamazlıqların aradan qaldırılmas vacib elmi-praktiki əhəmiyyət kəsb etməklə yanaşı aktual hesab edilir. Belə ki, təklif olunan qurğu istehsal olunan qumun yuyularaq toz, gil və lil hissəciklərindən təmizlənməsinə tam imkan verir. Belə bir təmizləyici qurğunun qum istehsal edən müəssisələrdə quraşdırılması və istifadə edilməsi bu gün üçün aktual hesab olunur. Məsələnin həllinə qumun təmiz, keyfiyyətli, itkisiz yuyulması və istismar xərclərinin azaldılması üçün yeni qumyuyan qurğu ilə nail olmaqdır.

**Metodlar**

Təklif olunmuş qumyuyucular ilə müqayisədə təklif olunan faydalı model qumyuyucusunun səmərəli və üstün cəhətləri aşağıdakılardır [9, 10]:

**Səlisliyi.** Qum yuyucusu məhsuldarlığı yüksək və istismar müddəti uzun, qumyuma ehtiyacını tamamilə ödəyə bilən və ideal yeni qumyuma avadanlığıdır.

**İşləmə prinsipi.** Şaquli vəziyyətdə quraşdırılmış qurğunun boruşəkilli gövdəsinə aşağı hissədən su və hava verilir. Boruşəkilli gövdə su ilə dolduqdan sonra onun yuxarı hissəsindən yataqdan götürülmüş çirkli qum verilir. Eyni zamanda, boruşəkilli gövdənin aşağı hissəsindən su və havanın birgə verilməsi zamanı gövdənin içərisində qum dənəciklərinin qaynama prosesinə bənzər, xaotik hərəkəti baş verir. Proses zamanı gövdənin aşağı hissəsindən verilən təmiz su qum dənələrinə yapışmış olan gil, lil və çirk hissəciklərini yuyur və borunun yuxarı hissəsində çirkli su üçün quraşdırılmış boru vasitəsi ilə kənara çıxır. Proses davam etdikcə qum yuyulur və kənara çıxan su durulur.

Boruşəkilli gövdənin aşağı hissəsində quraşdırılmış klapanın açılması ilə yuyulmuş qum qurğudan boşaldılır. Beləliklə, proses təkrarlanır və nəticədə keyfiyyətli, yuyulmuş, təmiz inşaat qumu alınır. Təcrübə zamanı sınaqdan keçirilən qurğu şəkil 1-də göstərilmişdir. Sınaq zamanı məlum olmuşdur ki, göstərilən qurğu yataqdan çıxarılmış çirkli qum kütləsini yuyaraq təmizləməyə imkan verir. Təklif olunan qurğunu qum istehsal edən müəssisələrdə (karxanalarda) quraşdırmaq

və istifadə etmək üçün nəzərdə tutulmuşdur. Məsələ, həmçinin, istənilən növ qumun və digər inert materialların təmiz yuyulması üsulu ilə həll olunur. Şərti adı "J.J.Clean Sand" (JJCS) olan qumyuyan qurğu sənayedə hər növ qum istehsalı üçün nəzərdə tutulmuş yeni bir qumyuma texnologiyasının hazırlanmasından ibarətdir ki, bu səbəbdən də karxanalardan çıxarılan narın və iri dənəli qumların toz, lil və gil qarışıqlarından yuyularaq təmizlənməsi kimi avtomatlaşdırılmış və madelləşdirilmiş müasir qumyuma texnologiyası hazırlanır. Bu üsul, yuxarıda da tərif olunduğu kimi, karxanalardan çıxarılan narın və iri dənəli qumların toz, lil və gil qarışıqlarından yuyularaq təmizlənməsi kimi avtomatlaşdırılmış və madelləşdirilmiş müasir qumyuma qurğusunun hazırlanması, konkret nəzəri və təcrübi hesablamalarla öz təsdiqini tapmışdır.

"J.J.Clean Sand" (JJCS) adlandırdığımız qumyuyan qurğu sənayedə hər növ qum istehsalı üçün nəzərdə tutulmuşdur. Yeni qumyuma texnologiyası hazırda dünyada, o cümlədən Respublikamızda geniş yayılmış qumyuyan qurğuların əvəzi kimi düşünülmüşdür. Hesab edilmişdir ki, mövcud olan qumyuyan qurğular qumyuma texnologiyasına görə aşağıdakı səbəblər üzündən perspektivli görünmür:

- ehtiyatları ya artıq yoxdur, ya da tükənmək üzrə olan çay vadilərindən götürülmüş qumlar mövcud olan qurğular vasitəsi ilə yuyularkən istehsalat üçün yararlı olan xammal kimi kiçik ölçülü qum dənələrinin itkisinə səbəb olur;
- son illər ölkəmizdə tikinti işlərinin geniş vüsət alması təmiz inşaat qumuna olan tələbatı xeyli artırmışdır. Bu da yuxarıda qeyd olunan səbəblər üzündən müəyyən problemlər yaradır (məsələn, karxanadan çirkli qumu emal etmədən istifadəsi, yuyularkən istehsalat üçün yararlı hesab edilən kiçik ölçülü qum dənələrinin itkisi və s.);
- ənənəvi "qumyuyan qurğular" inşaat qumu istehsalında bir sıra texnoloji çətinliklərlə, məlum texniki göstəricisinin çatışmazlıqlarına aid olan texniki-mexaniki xüsusiyyətlərin qeyri-qənaətbəxş olması, xırda qum itkisi, aşağı məhsuldarlıq, mürəkkəb dizayn, çətin xidmət, detalların tez sıradan çıxması, əl işlərinin çoxluğu və yüksək istismar xərcləridir ki, bu amillər təmiz və itkisiz qumyuma üçün əlverişsiz olması ilə xarakterikdir ki, bu da yeni tip qumyuyan qurğunun istehsalının təşkilini zəruri edir;




a) b)

**Şəkil 1.** "J.J.Clean Sand" (JJCS) qumyuyan qurğu




1 – bunker; 2 – ilkin qum; 3 – kamerada giriş dəliyi; 4 – bunkerdən kameraya buraxıcı klapan; 5 – təzyiq klapanı; 6 – metal zəncirlər; 7 – baxış pəncərəsi; 8 – kamera; 9 – kameranın yuxarı hissəsi; 10 –yuyulmuş qumun buraxılması üçün qapının idarəetmə sistemi; 11 – yuyulmuş qumun buraxılması üçün qapı; 12 – kameraya suyu buraxmaq üçün klapanın idarəetmə sistemi; 13 – kameraya suyu buraxmaq üçün klapan; 14 – kameranın aşağı hissəsi; 15– yüksək təzyiq altında havanı kameraya vermək üçün klapanın idarəetmə sistemi; 16 – yüksək təzyiqi altında havanı kameraya vermək üçün klapan; 17 – kiçikoyuqlu metal barmaqlıq (metal tor); 18 – sulu-gilli şlamın çıxışı; 19 – kamerada işıqlanma sistemi; 20 – bünövrə; 21 – elektrik paneli; 22 – ekran (mərkəzi kompüter şəbəkəsi); 23 – start düyməsi; 24 – təcili dayandırma (stop); 25 – manometr.

- qumyuma ehtiyacını tamamilə ödəyir;
- ənənəvi “qumyuyan qurğular” təmiz və itkisiz inşaat qumunun fiziki-mexaniki xassələrini və bu tip qurğulara qoyulan tələbləri (aşağı məhsuldarlıq, mürəkkəb dizayn, çətin xidmət, detalların tez sıradan çıxması, əl işlərinin çoxluğu və yüksək istismar xərcləri və s.) ödəmir.

Təklif olunan qumyuyan qurğu tamamilə yeni tip qumyuma texnologiyasının hazırlanmasından ibarətdir ki, bu səbəbdən də karxanalardan çıxarılan narın və iri dənəli qumların toz, lil və gil qarışıqlarından yuyularaq təmizlənməsi kimi avtomatlaşdırılmış və madelləşdirilmiş müasir qumyuma texnologiyası kateqoriyasına aid etmək olar. Bu qurğu əsasən avtomatlaşdırılmış və madelləşdirilmiş müasir qumyuma texnologiyalarına əsasən hazırlandığından aşağıda sadalanan bir sıra üstünlüklərə malikdirlər:

- istənilən ölçüdə, sadə dizaynla hazırlana bildiyindən, konstruksiya və memarlarıq nöqteyi-nəzərindən inşaat, dağ-mədə sənayesi qarşısında böyük perspektivləri açılır;
- böyük kapital qoyuluşu tələb etmir;
- texnoloji baxımdan sadədir;
- maya dəyəri yüksək deyildir;
- məhsuldarlığı yüksəkdir;
- 24 saat dayanmadan işləmə qabiliyyətinə malikdir;
- istismar müddəti uzundur;
- təmiz qumyuma xüsusiyyətinə malikdir;
- məhsul itkisi yoxdur;
- asan xidmətə malikdir;
- aşağı enerji istehlakına malikdir;
- detalları etibarlı və uzunömürlüdür;
- aşağı istismar xərcinə malikdir;
- hazır məhsulun fiziki-mexaniki xassələri “ənənəvi qumyuyan qurğular”ın məhsullarının fiziki-mexaniki xassələrindən xeyli yüksəkdir;
- təklif olunan qumyuyan qurğu inşaat qumunun təmiz və itkisiz yuması ilə yanaşı digər inert materialların yumasında üstünlük təşkil etdiyi üçün əvəzolunmaz qurğuya çevrilir;
- çəkisi 1,5-2 dəfə “ənənəvi qumyuyan qurğular”ın çəkisinə nisbətən azdır ki, bu da son nəticədə qurğunun daşınma yükünü azaldır, istehsal xərclərini aşağı salır, istismar işini asanlaşdırır və tezləşdirir, xüsusi əlavə motor, val, reduktor və s. qoşulmasında istifadəni istisna edir, bütövlükdə inşaat qumunun, o cümlədən, qumyuma işlərinin maya dəyərini aşağı salır;
- təklif olunan qumyuyan qurğu yüksək keyfiyyətli inşaat qumunun gil, lil və toz hissəciklərindən yuyulub təmizlənməsi qabiliyyətinə malikdir.

Avtomatlaşdırılmış, madelləşdirilmiş müasir qumyuma texnologiyalarına əsaslanaraq hazırlanmış “J.J.Clean Sand” (JJCS) qurğusu sadə dizayn üsulu ilə hazırlanaraq inşaat qumunun yuyulmasında

geniş imkanlara malikdir. Texnologiya eyni üsulla səmərəli digər inert materialların yuyulub hazırlanmasında da tətbiq oluna bilər.
İnert inşaat materiallarının (çınqıl, qum və qırmadaşı), xüsusən də inşaat qumunun tərkibində olan zərərli qarışıqlarının təmizlənməsində istifadə oluna yeni avtomatlaşdırılmış qumyuyan üsulun və qurğunun hazırlanması. Həmçinin eksperimental nəticələrə əsaslanaraq müxtəlif irilik modullu inşaat qumunun tərkibində olan gil, lil və toz qarışıqlarının yuyularaq təmizlənməsi müəyyənləşdirilmişdir.
Yeni avtomatlaşdırılmış və modelləşdirilmiş qumyuyan qurğunun istehsal etdiyi təmiz inşaat qumu əsasında inşaat məhlulundan və beton qarışığından hazırlanmış müxtəlif nümunələri üçün bərkimə prosesləri tədqiq edilərək, onların daxilində yaranan fiziki-mexaniki prosesləri müəyyənləşdirilmişdir.

**Nəticə**
Öz çoxkomponentli hidrodinamikası və ilkin qumun gilli qatışığı ilə öz arasında və coşan (qaynayan) sulu-havalı mühitlə qarşılıqlı təsiri nəticəsində ilkin qumun intensiv disperqasiyasına (yəni qumlu hissəciklərin gilli kiçik dispersli hissəciklərdən ayrılmasına) imkan verir. Təklif olunan ixtiranın ikinci yeni əlaməti onunla bağlıdır ki: ancaq qaynayan mühitin (sulu-havalı-qumlu-gilli), kameranın yuxarı hissəsində bərkidilmiş, kinematik sallanan əyilən elementləri ilə birgə biri-birinə qarşılıqlı təsiri nəticəsində qaynayan mühiti əlavə disperqasiya edir;
Göstərilən əyilən kinematik elementlər turbulent, qaynayan dördfazalı mühitdə titrəyiş, dinamik müqavimət yaranmasına imkan yaradırlar, hansı ki, qumlu hissəciklərin qalan gilli qarışıqlardan əlavə disperqasiyasına imkan yaradır, həmdə ayrı gilli üzən aqreqatları disperqasiya edirlər. Təklif olunan qurğu istehsal olunan qumun yuyularaq toz, gil və lil hissəciklərindən təmizlənməsinə tam imkan verir. Belə bir təmizləyici qurğunun qum istehsal edən müəssisələrdə quraşdırılması və istifadə edilməsi bu gün üçün aktual hesab olunur. Məsələnin həllinə qumun təmiz, keyfiyyətli, itkisiz yuyulması və istismar xərclərinin azaldılması üçün yeni qumyuyan qurğu ilə nail olunur.

**ƏDƏBİYYAT**

1. AzDTN 2.16-1 “Concrete and reinforced concrete structures”. Design norms.- Baku, 2015, 131 p.
2. Jamalov J.A. Some features of reliability and longevity of construction structures // Azerbaijan Scientific Research Institute of Construction and Architecture, Scientific innovations in construction and architecture.- Baku, 2019, pp. 131-139
3. Jamalov D.A. Research of reliability and durability of reinforced concrete structures // Science and world. International scientific journal. ISSN 2308-4804 Impact factor of the journal -0325 (Global Impact Factor, Australia) .-Volgograd, 2015, №2 (18), Vol. I.- p. 64-70.
4. Zasedatelev I.B., Mamedov F.Y., Mishin G.V., Kuznechenkov Y.I. Method for determination of cement hydration heat / Aut. Certificate № 263221.- 2014.
5. Ignatova L. N. Strategic resources as a factor in the competitive advantages of a modern corporation: monograph. - M.: Publishing House of the Academy of Labor and Social Relations, 2015.- 141 p.
6. Akulenko N.B. Strategy for financing the technical development of enterprises // Handbook of an economist. -2012, No. 1, p. 38.

ISSN: 1609-1620, E-ISSN: 2674-5224
PAHTEI
REFEREED & REVIEWED JOURNAL
E-ISSN: 2674-5224
VOLUME 21 ISSUE 10 2022

Civə ilə zəhərlənmənin simptomları bir neçə aydan sonra, hətta bir neçə ildən sonra da baş verə bilər.
Civə zəhərlənməsinin əsas əlamətləri:
- artan yorğunluq
- yuxu pozğunluğu
- ürəkbulanma
- zəiflik
- miqren
- başgicəllənmə
- depressiya, əsəbilik
- yaddaşın, diqqətin pisləşməsi

Metal civə buxarına yüksək dozada qısa müddətli məruz qalmalarda ağciyərin zədələnməsi, ürəkbulanma, qusma, ishal və qan təzyiqinin artması, dəridə qızartının yaranması (şəkil 1) və göz qıcıqlanması kimi simptomlar baş verə bilir.



**Şəkil 1.** Civə zəhərlənməsi zamanı dəridə qızartı əlamətləri

Civə zəhərlənməsi zamanı barmaqların titrəməsi tədricən inkişaf etməyə başlayır və göz qapaqlarına, dodaqlara ağır hallarda isə ayaqlara və hətta bütün bədənə keçir.

**Metodlar**

Civə orqanizmə 2 yolla: ağızdan və ya buxarlarının inhalyasiyası ilə daxil ola bilər. Civənin nəfəsyoluna keçməsi ağciyərin kimyəvi iltihabına (şəkil 2), toxumaların məhvinə səbəb olan bronxitin əmələ gəlməsinə və məruz qalma davam edərsə ölümə səbəb olur. Hüceyrə membranının effektivliyini dəyişir, DNT sintezini pozur. Nəticədə sinir sistemi məhv olur. Metal civə buxarına yüksək dozada qısa müddətli məruz qalmalarda ağciyərin zədələnməsi, ürəkbulanma, qusma, ishal, ürək dərəcəsinin və qan təzyiqinin artması, dərinin qızartı və göz qıcıqlanması kimi simptomlar baş verə bilir.
Civə ilə zəhərlənmə buxarlanmış civənin nəfəs alması və qidaya daxil olması nəticəsində baş verir. Zəhərlənmənin əlamətlərini asanlıqla ayırd etmək mümkün olmadığından, diaqnoz qoymaq çətinləşir.



ISSN: 1609-1620, E-ISSN: 2674-5224
PAHTEI
REFEREED & REVIEWED JOURNAL





**Şəkil 2.** Civə zəhərlənməsi zamanı ağciyərlərin zədələnməsi

Bununla belə, qırılan bir termometrdən kiçik miqdarda civənin səpilməsi anında onun asanlıqla buxarlanması səbəbindən hətta ölümə səbəb ola biləcəyi üçün diqqətlə təmizlənməlidir. Civə termometrləri də daxil olmaqla, civə nəqliyyat vasitələri olan müəssisə və təşkilatlar civə dağılmalarına hazır olmalı, dağılmış civəni təhlükəsiz şəkildə təmizləməyi bilməlidirlər.
Dağılan civə vaxtında təmizlənməzsə, davamlı olaraq buxarlanmağa davam edir. Xüsusilə evdə iməkləyən körpələr üçün daha böyük təhlükə yaradır. Havada olan civənin miqdarı (zamanla çəkilmiş) kubmetr üçün 0,05 milliqramdan çox olmamalıdır.
Civənin dağılması zamanı edilməli və edilməməli olan əsas təcrübələr cədvəl 1-də göstərilmişdir:

**Cədvəl 1.** Civə dağılması zamanı görülməli olan tədbirlər.

| Edilməli olan | Etmək olmaz |
|---|---|
| Ərazi boşaldılmalıdır. | Civəyə çılpaq əllərlə toxunmaq olmaz. |
| Ərazinin yaxşı havalandırıldığına əmin olmaq lazımdır. | Tozsoran istifadə edilməməlidir. |
| Civəni çıxarmaq üçün şpris istifadə edilməlidir. | Tualetlərə və çirkab su kanallarına tökülməməlidir. |
| Civə su ilə dolu möhkəm bağlanmış qaba tökülməlidir. | Civə tökülən yerə ayaq basmaq, yerimək olmaz. |
| Xalça, ədyal, üzlük və ya digər yumşaq materiallara tökülərsə, onlar atılmalıdır.<br>Müvafiq qurumlara xəbər verilməlidir. | |
| Civəi toplamaq üçün soyuq su və ya kalium permanganat məhlulu (tünd rəngli) ilə şüşə qab hazırlanmalı (su civənin buxarlanmasına imkan verməyəcək). | |

Araşdırmalar nəticəsində məlum olmuşdur ki, civə ionları qalxanabənzər vəzdə toplanır, qalxanabənzər vəzdə düyünlər və xərçəng hüceyrələrinin əmələ gəlməsinə səbəb olur. Norveçdə civə və qalxanabənzər vəzi xərçəngi ilə bağlı tədqiqatlar aparılmış və dəniz məhsullarında olan MeHg-nin dəniz məhsulları sənayesində çalışan və dəniz məhsulları istehlak edən insanlarda

tiroid (qalxanabənzər vəz) xərçənginin inkişaf riskini əhəmiyyətli dərəcədə artırdığı müəyyən edilmişdir.

**Civəli termometrlər ilə bağlı alınan tədbirlər**

Civəli termometr təhlükəsini aradan qaldırmaq üçün bir sıra tədbirlər alınmışdır. Şəkil 3-də 2013-cü il 22 yanvar tarixindən civəli termometrləri qadağan edən Avropa İttifaqı ölkələrinin xəritəsi göstərilmişdir. Mavi rəngdə olan ölkələr bu məsələ ilə bağlı qanuni qadağalar qoymuş, boz rəngdə olan ölkələrin statusu naməlumdur. Qırmızı rəngdə olan ölkələr isə bu tədbirləri zəruri hesab etməyənlərdir.

Bəzi ştatlar və bələdiyyələr civə termometrlərinin istehsalını, satışını qadağan edən qanunlar və ya sərəncamlar qəbul ediblər. Bu tədbirlərin hər biri termometrlərin sınması təhlükəsini və sonradan içərisindəki civə buxarının sərbəst buraxılmasını aradan qaldırmağa kömək etmək üçündür.



**Şəkil 3.** Civəli termometrləri qadağan edən Avropa İttifaqı ölkələrinin xəritəsi.

Civənin istifadəsinin dayandırılması haqqında digər bir addım Minamata Konvensiyasının imzalanması olmuşdur ki, burada "Civəsiz sağlamlığa nail olmaq" təşəbbüsü ilə civə termometrlərinin və tərkibində civə olan qan təzyiqi cihazlarının istehsalının və istifadəsinin mərhələli şəkildə dayandırılmasını tələb olunur.

Beləliklə, bu Konvensiyada sözügedən cihazların istehsalının, idxalının və ixracının dayandırılması dəqiq, sərfəli və təhlükəsiz, ən əsası civəsiz alternativlərin tətbiqinin dəstəklənməsinə gətirib çıxaracağı qeyd olunmuşdur. Həmçinin, Konvensiya ölkələrə civənin zərərli təsirlərinin aradan qaldırılması, sənayedə civə buxarının azaldılması, uşaqları və reproduktiv yaşda olan qadınları civənin təsirindən qorumaq və civədən istifadənin tamamilə dayandırılması üçün ətraflı fəaliyyət planı təqdim edir.

ÜST-nin İctimai Səhiyyə və Ətraf Mühit üzrə Direktoru Dr.Maria Neira ÜST-nin civəyə məruz qalma hallarının kritik aspektlərinə daha çox diqqət yetirəcəyini və Konvensiya, xüsusən də ictimai sağlamlıqla bağlı öhdəliklərini yerinə yetirmək üçün hökumətlərlə işləyəcəyini bildirmişdir.




**Civəli termometrlərin əvəzlənməsi üçün alternativ tempratur ölçmə vasitələri**

Civə ilə doldurulmuş maye şüşəli termometrlər müxtəlif laboratoriya və sənaye tətbiqlərində uzun müddət istifadə edilmişdir. Bu termometrlərin performansı yüksək səviyyədə olsa da, civə termometrlərinin satışına dair qoyulan qadağalar və yaratdığı təhlükələr onların mövcudluğunu məhdudlaşdırır. Qırılan termometrlərdən tökülən civə ətraf mühit və təhlükəsizlik üçün risk yaradır.

Civə termometrlərinin istifadəsinin azaldılması məqsədilə eyni dərəcədə alternativ olaraq müxtəlif dəqiq, effektiv sərfəli və etibarlı civəsiz termometrlər mövcuddur. Spirtlə doldurulan Fisher-Scientific termometrlərinin təmizlənməsi daha asan və təhlükəsizdir. Eyni zamanda, mikroprosessorlu rəqəmsal oxuyan termometrlər də vardır.

Elektron rəqəmsal termometrin nümunəsi platin müqavimət termometridir. Bura, həmçinin, termistor və termocüt daxildir. Platin müqavimətli termometr geniş temperatur diapazonunda civə tərkibli termometrlər qədər dəqiqdir.

Tərkibində civə olan termometr kimi, platin müqavimət termometri də mexaniki zərbəyə həssasdır. Termistorlar isə daha az həssasdır. Lakin, termocütlər zərbəyə davamlıdır.

Civə termometrlərinə ən oxşar alternativlər batareya və günəş enerjisi ilə işləyən rəqəmsal termometrlərdir. Bunlar həm qiymət, həm də istifadə baxımından civə termometrlərinə bənzəyir. İstifadəsi və oxunması asan olan termometrlərdir. Civə olmayan üzvi maye ilə doldurulmuş şüşə termometrlər də civə termometrlərini əvəz edir.

Qeyd etmək lazımdır ki, elektron termometrlər adətən civə tərkibli termometrlərdən daha bahalı olur.

Təhlükəli olmayan üzvi mayelərlə doldurulmuş şüşə termometrlərin ölçmə diapazonu -100 °C ilə +100 °C (-148 °F ilə 212 °F) aralığında və buraxılabilən xəta 0,5 °C olduqda yaxşı seçimdir. Qeyd etmək lazımdır ki, ticarətdə mövcud olan termometrlər üçün müxtəlif üzvi mayelərdən istifadə olunur.

Vizual olaraq civəyə çox oxşar, lakin daha təhlükəsiz "Qalinstan termometrləri" də mövcuddur. Temperaturu ölçmək üçün civə əvəzinə, adından da göründüyü kimi, qalinstan (qalium, indium və qalay qarışığı) istifadə olunur  Bu maye metal zərərsiz və ekoloji cəhətdən təmizdir. Bu termometrlər civəli termometrlərlə eyni şəkildə görünür və istifadə olunur.

Qalinstan termometrlərinin üstünlükləri:
- Sabit ölçmə dəqiqliyi (xəta- 0,1 dərəcə);
- Civəli termometrlər kimi müxtəlif ölçmə üsulları;
- Davamlılıq;
- Dezinfeksiya asanlığı.

Elektron termometrlərin üstünlükləri civə termometrlərinin üstünlüklərindən az deyil. İlk öncə qeyd etmək lazımdır ki, onlar civədən daha təhlükəsizdirlər və elektron termometrlər temperaturu civədən daha sürətli ölçürlər. Ancaq təbii ki, onların da əhəmiyyətli çatışmazlıqları var. Elektron termometrlərin batareyaları dəyişdirilməlidir və əksər hallarda daha az davamlıdırlar. Əksərən, bu cihazların dəqiqliyinin civəli termometrlərin dəqiqliyindən daha az olduğu qeyd olunur.

Civə termometrlərini elektron termometrlərlə əvəz etməyin bir sıra üstünlükləri mövcuddur:
- Nəticəni ekrandan oxumaq və onu cihazın daxili yaddaşında saxlama imkanı;
- Şüşədəki civə termometrləri ilə müqayisədə elektron cihazların möhkəmliyi və etibarlılığı, təhlükəsizliyi;
- Avtomatlaşdırılmış proses.


ISSN: 1609-1620, E-ISSN: 2674-5224
PAHTEI
REFEREED & REVIEWED JOURNAL
E-ISSN: 2674-5224
VOLUME 21 ISSUE 10 2022

Bu gün ən yaxşı termometrlər həm sürət, həm də dəqiqlik baxımından rəqəmsaldır. Maye ilə doldurulmuş termometrdən və bi-metal termometrdən fərqli olaraq, rəqəmsal termometrlərə sensor lazımdır. İstifadə olunan bir neçə məşhur sensor mövcuddur:

- Termocütlər
- Müqavimət Temperatur Detektorları (RTD və ya PT100)
- Termistorlar

Temperatur ölçmə vasitərindən biri də infraqırmızı termometrlərdir (pirometr). Bu termometrlər həm təhlükəsiz, həm də nəticəni daha sürətli göstərən tempratur ölçmə vasitələridir. Pandemiya dövründə bu termometrlərin istifadəsi daha da genişlənmişdir. Müasir texnologiya pirometrlərin dəqiqliyini daim təkmilləşdirir. Alətin infraqırmızı detektoru hədəfdən əks olunan lazer enerjisinin miqdarını ölçür və mikroprosessor nəzarəti emissiyanı kompensasiya etmək üçün bu əlavə enerjini dəqiq dəyərə çevirir. Pirometrlər obyektin infraqırmızı emissiyasını ölçməklə temperaturu ölçür. Kameranın içərisinə quraşdırılmış kiçik infraqırmızı sensor qara cisim divarlarının emissiyasını ölçür.

Onlar, infraqırmızı enerjini ətraf mühitin temperaturu dəyişkənliyinə görə kompensasiya edildikdən sonra enerjini temperatur vahidlərində göstərilə bilən elektrik siqnalına çevirən detektora yönəldən obyektivdən ibarətdir.

Pirometrlərin hesablama texnikası aşağıdakı kimidir:

Şüalanmanın spektral parlaqlığını istənilən temperaturda dalğa uzunluğundan asılı olaraq dəyişir.

$$\Lambda = \frac{b}{T} \qquad (1)$$

Bu cihazların hesabama texnikası əsasında aparılır. Lakin, bu termometrlər üçün mənfi cəhətlərdən biri onların xətalarının nisbətən daha çox olmasıdır.

Civəli termometrlərin əvəzlənməsi üçün ən alternativ variant timpanik termometrlərdir. Onlar temperaturu təxminən 3 saniyəyə qeyd edir, 25 °-43 °C diapazonunda temperaturu ölçür və selikli qişalarla birbaşa təmas etmir. Bu termometrlərdə infraqırmızı şüa texnologiyasından istifadə olunur və qulaq kanalının daxilində temperatur ölçülür. Timpanik termometrlər temperaturu ən çox yayılmış üç temperatur şkalası Faranheyt, Selsi və Kelvin şkalalarına uyğun olaraq ölçürlər.

**Civəli termometr, timpanik termometr və infraqırmızı termometrlər vasitəsilə aparılan ölçmə nəticələrinin müqayisəli təhlilinin aparılması**

Civə buxarının insan həyatında yarada biləcəyi təhlükələri nəzərə alaraq məqalədə onların əvəzlənməsi üçün alternativ bir sıra ölçmə vasitələrinin adları çəkilmiş və onlar haqqında məlumat verilmişdir. Bu temperatur ölçmə vasitələrinin dəqiqlikləri haqqında informasiya əldə etmək məqsədilə həmin ölçmə vasitələri ilə aparılan ölçmələrin müqayisəli təhlilinə cədvəl 2-də nəzər salaq:

**Cədvəl 2.** Civəli termometr, timpanik termometr və infraqırmızı termometrlər vasitəsilə aparılan ölçmə nəticələrinin müqayisəli təhlili.




| № | Nümunəvi ölçmə vasitəsinin göstəricisi ℃ | Timpanik termometr ilə aparılan ölçmə nəticələri ℃ | Timpanik termometr Xəta ℃ | Civəli termometr ilə aparılan ölçmə nəticələri ℃ | Civəli termometr Xəta ℃ | İnfraqırmızı termometr ilə aparılan ölçmə nəticələri ℃ | İnfraqırmızı termometr Xəta ℃ |
|---|---|---|---|---|---|---|---|
| 1 | 36,6 | 36,6 | 0 | 36,5 | 0,1 | 36,8 | 0,2 |
| 2 | 36,7 | 36,7 | 0 | 36,6 | 0,1 | 36,5 | 0,2 |
| 3 | 36,5 | 36,5 | 0 | 36,5 | 0 | 36,6 | 0,1 |

Cədvəldə timpanik, civəli və infraqırmızı termometr vasitəsilə aparılan ölçmələrin nəticələri qeyd edilmişdir. Timpanik ölçmə vasitəsi ilə aparılan ölçmələrdə xəta 0 ℃, civəli termometrlər vasitəsilə aparılan ölçmələrdə xəta 0.1 ℃, infraqırmızı termometrdə isə 0,2 ℃ olaraq müəyyən olunmuşdur.
Aparılan ölçmə nəticələrinə əsasən timpanik termometrlərlə aparılan ölçmə nəticələrinin daha dəqiq olduğu görünür.

**Nəticə**
Civə zəhərlənməsinin qarşısının tam alına bilməməsini, çox kiçik dozalarda belə ağır nəticələrə səbəb olmasını və rəqəmsal texnologiyaların insan həyatının bütün sahələrində sürətlə inkişaf etdiyini nəzərə alaraq, bu termometrlərin istifadəsini minimumuma endirəcək, həmçinin tamamilə dayandıracaq Konvensiya imzalanmışdır. Civəli termometrlərin satışı bir çox ölkədə dayandırılmış və qadağan edilmişdir.
Civəli termometrlərin insan həyatı, eyni zamanda onların qırıldığı zaman civənin asanlıqla buxarlanaraq həm ətraf-mühit, həm də bütün canlı aləmi üçün yaratdığı təhlükəni nəzərə alaraq civəli termometrlərin əvəzlənməsi üçün bir sıra alternativ həll yolları işlənib hazırlanmışdır.
Məqalədə civəli termometrlərin əvəzlənməsi üçün alternativ variant sayıla biləcək temperatur ölçmə vasitələrinin adları çəkilmiş və onlar haqqında məlumatlar verilmişdir. Bu temperatur ölçmə vasitələri vasitəsilə aparılmış ölçmələrin nəticələrinin müqayisəli təhlili aparılmış və ölçmə vasitələrinin mənfi, müsbət tərəfləri qeyd olunmuşdur.
Civəli termometrlərin əvəz edilməsi üçün alternativ variant sayıla biləcək timpanik və infraqırmızı termometrlər vasitəsilə ölçmələr aparılmış və alınan ölçmə nəticələrinin müqayisəli təhlilinə əsasən timpanik termometrlərin dəqiqliyinin daha yüksək olduğu məlum olmuşdur.

**ƏDƏBİYYAT**

1. E.B. İsgenderzade, Z.Y. Aslanov. Olchme ve nezaretin usul ve vasiteleri. -Baki, 2017
2. A.M.Gafarov. "Metrologiyta,standartlashdirma, sertifikatlashdirma" Baki, 2012 Seh. 30-40.
3. Mammadov N.R, Aslanov Z.Y, Seyideliyev İ.m, Hacizalov M.N.Dadashova K.S. "Metrologiya,standartlashdirma,sertifikatlashdirma".-Baki 2015. Seh 32-45.
4. Rusin S.P. "Opredelenie istinnoy temperaturi neprozracnix materialov po spektru teplovoqo izluceniya: kompyuternoe modelirovanie."-2021. Seh. 25-30.
5. https://web.mst.edu/~cottrell/ME240/Resources/Temperature/Temperature.pdf zehirlenmesi
6. http://www.nparso.ru/images/docs/Thermometers.pdf
7. https://dmliefer.ru/katalog/kip/pribory-dlja-izmerenija-temperatury

# ВЛИЯНИЕ РТУТНЫХ ТЕРМОМЕТРОВ НА ЖИЗНЬ ЧЕЛОВЕКА

**Айтадж Алиева[1], Майя Каримова[2]**
[1]магистр/ E-mail: aytaca00@mail.ru
[2] кандидат технических наук, преподаватель. E-mail: mkerimova1971@rambler.ru
[1,2] кафедра приборостроения
[1,2]Азербайджанский государственный университет нефти и промышленности.

## РЕЗЮМЕ

Несмотря на то, что цифровые технологии занимают большое место во всех сферах жизни человека, ртутные термометры до сих пор используются большим количеством людей. Ртутные термометры имеют простой принцип работы. Принцип его работы основан на расширении жидкости под воздействием температуры. Эти термометры оснащены калиброванной шкалой от 35°C до 42°C. В настоящее время ртутный термометр является одним из самых распространенных приборов для определения температуры тела человека. Ртутные термометры имеют возможность широкого применения в медицине, а также приемлемую цену и полную дезинфекцию прибора. Устройство очень простое и удобное в использовании. Однако серьезные недостатки этих термометров привели к тому, что они стали реже использоваться, а в некоторых странах были запрещены в качестве прибора для контроля температуры. Его главный недостаток – использование ртути (около 2 граммов), что очень опасно для здоровья.
В результате исследований, проведенных с ртутными термометрами, было подтверждено, что эти измерительные приборы вызывают ряд заболеваний. По этой причине во всем мире начали принимать ряд мер в отношении этих термометров. Во многих странах использование ртутных термометров запрещено и их продажа прекращена.
В статье приведены сведения о роли ртутных термометров в жизни человека, их опасности, плюсах и минусах, а также о ряде средств измерения температуры, предлагаемых на их замену, и показаны результаты измерений для альтернативных вариантов.
Ключевые слова: средства измерения температуры, альтернативные средства измерения, анализ по результатам измерений, ртутные термометры, опасность ртутного термометра

Publication history

Article received: 27.09.2022
Article accepted: 06.10.2022
Article published online: 22.10.2022
DOI suffix: 10.36962/PAHTEI21102022-71

E-ISSN: 2674-5224

81-90 VOLUME 21 ISSUE 10 2022



ISSN: 1609-1620, E-ISSN: 2674-5224

P A H T E I

REFEREED & REVIEWED JOURNAL

# INVESTIGATION OF GAS FLOW IN A METAL PIPELİNE

**Kamal Nabiyev**
BP Caspian Exploration, Control room technician, PhD student
Email: nebiyevkamal@gmail.com

## ABSTRACT

The upstream flow of a turbulent gas suspension in a vertical pipe is simulated using the Euler-Lagrangian approach. Particle-particle and particle-wall collisions are simulated according to a deterministic approach. Here, the effect of particle collisions on particle concentration and variable velocities was investigated. Certain results are presented for different values of loading ratios. The particle concentration and temperature profiles are shown to be smoother when interparticle collisions are taken into account, while this effect on gas velocity and temperature is not as significant. It is noted that the effect of interparticle collisions has a slight effect on the particle fluctuation speed. Also, the particle concentration and particle velocity profiles flatten due to interparticle collisions, and this effect becomes more pronounced with increasing loading ratio. At the same time, the weakening of turbulence due to interparticle collisions in the main region of the pipe is accompanied by an increase in the loading ratio.

Effects of flow direction, nonlinear drag and the corrected lift force on particle depositionrate in turbulent pipeline flow is studied. A digital simulation technique is used and the trajectories ofparticles of different sizes are analyzed. The experimental data for the mean flow field and theintensities of fluctuation velocity components are used in the analysis, and the effects of turbulentdiffusion and Brownian dispersion are included in the computational model. The instantaneousturbulent fluctuation is simulated as a continuous Gaussian random vector field and the Brownianforce is modeled as a Gaussian white-noise random process. Ensembles of particle trajectories areevaluated and statistically analyzed. It is shown that the simulation results for the depositionvelocity are in reasonable agreement with the model predictions, the available experimental data,and the recent simulation results for channel flows. It is shown that the downward gas flow ina vertical pipe enhances the particle deposition rate, while the upward flow reduces it

Gases are the main energy carriers as fuels and consist of a mixture of gases consisting of light (methane, ethane, propane, butane), heavy hydrocarbons (pentane, hexane, heptane, etc.) and non-hydrocarbons.

Natural gas includes gas, gas-condensate and associated gases from oil fields.

Gases extracted from clean gas fields are considered dry gases. It is mainly composed of up to 98% methane. The low combustion temperature of these gases varies between 31000-38000 kC/ $m^3$.

Gases from gas-condensate fields consist of dry gas and condensate mixtures (gasoline, ligroin, kerosene).

Associated gases produced from oil fields together with oil include dry gases, including gasoline and propane-butane fractions.

The low combustion temperature of associated gases varies between 38000-63000 kC / $m^3$.

Depending on the amount of heavy hydrocarbons (propane and the latter), natural gases are divided into dry (less than 50 g / m$^3$), intermediate category (50-150 g / m3) and oily (more than 150 g / m$^3$) gases.
**Keywords:** Natural gas, crisis temperature, metal pipes, gas density, gas fields.

## QAZIN METAL BORUDA AXINININ ARAŞDIRILMASI

**Kamal Nəbiyev**
BP Kaspian Eksploreyşn, Hasilat üzrə Mərkəzi Nəzarət otağı texniki, doktorant
Email: nebiyevkamal@gmail.com

XÜLASƏ
Ən əsas enerji daşıyıcılarından biri də təbii qazlardır. Qazların molekulyar tərkibi yüngül, ağır karbohidrogenlər və qeyri-karbohidrogenlərdən ibarətdir.Təbii qazlara qaz-kondensatlar, qazlar və yataqlarından çıxan qazlar (səmt) aid edilir.
Qaz quyularından hasil olunan müəyyən qazları "quru qazlar" adlandırmaq olar. Bu qazların çox hissəsini isə metan qazı təşkil edir. Bu qazların aşağı yanma istilikləri 31000-38000 kC/m$^3$ arasında dəyişə bilir.
Kondensat qarışıqları və quru qazlar demək olar ki, qaz-kondensat yatağından alınan qazların əsasını təşkil edir **[1]**.
Açar sözlər: Təbii qaz, böhran temperaturu, metal borular, qazın sıxlığı, qaz yataqları.

Giriş
Demək olar ki, təbii qazların daxilində adətən $SO_2$, $H_2S$, $N_2$ kimi qazlar və nəmlik mövcud olur. Təbii qazların tərkibində olan bu komponentlər onların keyfiyyətinə mənfi təsir etdiyi üçün bu qarışıqlar tərkibdən təmizlənməlidir. Cədvəl 1-də təbii qaz komponentlərinin bəzilərinin fiziki xassələri verilmişdir.

**Cədvəl 1.** Təbii qaz komponentlərinin fiziki xassələri

| Qaz | Mole-kulyar kütlə-si, kq/mol | Qaz sabiti, C/kq·K | Böhran temperaturu, 0C | Böhran təzyiqi, MPa | Böhran sıxlığı , kq/m3 | Dinamiki özlülüyü (atmosfer təzyiqində), m ·106, Pa·s | | İstilik tutumu (00S- də), kC/(kq·K) | Sıxlığı (standart şəraitdə), kq/m3 | Yan- ma istiliyi, kC/m3 |
|---|---|---|---|---|---|---|---|---|---|---|
| | | | | | | 00C | 200C | | | |
| Metan CH4 | 16,042 | 528,70 | -82,10 | 4,648 | 162,0 | 10,20 | 10,70 | 2,18 | 0,718 | 33412,0 |
| Etan C2H6 | 30,07 | 281,90 | 32,10 | 4,953 | 210,0 | 8,770 | 9,390 | 1,64 | 1,345 | 59874,0 |

E-ISSN: 2674-5224
VOLUME 21 ISSUE 10 2022



ISSN: 1609-1620, E-ISSN: 2674-5224
P A H T E I
REFEREED & REVIEWED JOURNAL

| | | | | | | | | | | |
|---|---|---|---|---|---|---|---|---|---|---|
| Propan C3H8 | 44,096 | 192,30 | 95,60 | 4,405 | 226,0 | 7,650 | 8,160 | 1,54 | 1,965 | 86545,0 |
| Butan C4H10 | 58,123 | 145,90 | 152,80 | 3,620 | 225,0 | 6,950 | 7,540 | 1,58 | 2,496 | 114263,0 |
| Pentan C5H12 | 72,150 | 117,40 | 196,60 | 3,376 | 232,0 | 6,360 | 6,320 | 1,596 | 3,161 | 144032,0 |
| Karbon qazı CO2 | 44,012 | 192,70 | 31,10 | 7,394 | 468,0 | 14 | 16,50 | 0,815 | 1,871 | 0 |
| Hidrogens ulfid H2S | 34,084 | 242 | 100,40 | 9,006 | 0 | 12,30 | 0 | 0,991 | 1,454 | 21772,0 |
| Azot N2 | 28,018 | 302,60 | 147,10 | 3,393 | 311,0 | 17,10 | 16,40 | 1,055 | 1,184 | 0 |
| Hava | 28,96 | 292,70 | 140,70 | 3,778 | 310,0 | 17,450 | 18,21 | 1,006 | 1,208 | 0 |

**Məqsəd**

Qazılmış quyunun açılması və mənimsənilməsi zamanı quyu konstruksiyalarının və qoruyucu kəmərlərin seçilməsi böyük əhəmiyyətə malikdir. Lakin elə vaxt olur ki, layın müvəffəqiyyətlə açılması qazıma zamanı baş verir. Amma quyunun konstruksiyası doğru seçilmədiyi və kəmərin yekun istismar parametrləri doğru götürülmədiyi üçün istismar edilməsi üçün layın açılması qeyri-mümkün olur. Quyu konstruksiyası, istismar borusunun təyin olunması və sementlənməsi elə təşkil olunmalıdır ki, aşağıda qeyd olunanlar yerinə yetirilsin [4]:

a) lay verilən üsullardan hər hansısı ilə açılmalıdır, digər mayelərin axılmasına yol verilmədən quyu nəzarət altında mənimsənilməlidir. Gündəlik və son neft-qaz hasilatı təmin edilməlidir;

b) istismar ediləcək borunun ölçüləri maye və qazın norma ilə müəyyən edilmiş qədərdə əldə olunmasına, müəyyən edilmiş üsulla istismarına uyğun olmalıdır;

c) quyunun gövdəsi kifayət qədər möhkəmləndirilməklə ucuz başa gəlməlidir,

ç) bütün dövrlərdə quyunun istismarına qadağa qoyulmamalı və bu mümkün olmalıdır;

d) yatağın geoloji profili nəzərə alınmalıdır. Sulu-qazlı və uçmuş ara qatlar kəmərlərlə örtülməlidir;

e) istismar olunan vaxtda quyunu alt horizontlardan üsthorizontlara doğru gətirilməsi lazım olduqda bu horizontlarda quyunun uzunluğunun artırılması labüd olmalıdır.

İstismar olunacaq quyunun konstruktiv parametrləri aşağıdakı kimi olur:

a) diametri adətən 16.0, 18.0, və ya 20.0", uzunluğu isə 15.0-100.0 m olan yönəldicidən;

b) diametri 10.0 və 18.0"dən (stasionar qazıma qurğusu ilə işlədiyi zaman) 8.0"ə kimi (səyyar qazıma qurğusu ilə işlədiyi zaman), uzunluğu isə 30.0-600.0 m olan konduktordan;

c) diametri 8.0, 10.0, 11.0, 12.0" olan və yaş horizontların yatım dərinliyinə qədər endirilən aralıq texniki və suyun bağlanması üçün olan kəmərlərdən;

ç) diametri 31/2; 4.0; 5.0; 6.0; 7.0" bəzən də 8.0" olan istismar oluncaq kəmərdən ibarət olur. Son vaxtlarda əksər zamanlarda quyunun istismarında bir kəmərli konstruksiyadan, 3500 m-dən dərində olan layların qazılmasında isə iki kəmərli konstruksiyadan istifadə edirlər [1, 6].

**Metodlar**

Qaz yataqlarının işlənməsinin layihəsini vermək üçün gündəlik qaz hasilatının miqdarına görə quyuda təzyiqin fərqli olması və qaz-su birləşməsinin hərəkət etməsi aydınlaşdırılmalıdır. Yatağın və ya quyunun rejimindən asılı olaraq bu amillərin fərqli olması normal haldır. Qaz yatağının işlənilməsi subasqı, qarışıq və qaz rejimlərində ola bilər. Qaz rejimində təzyiq qazın quyunun

dibinə axmasını təmin edir. Subasqı rejimində konturdan axan mayelər laydan çıxmış qazın əvəzinə təzyiqin eyni miqdarda qalmasına kömək edir. Qarışıq rejimdə isə qaz, həm su basqısı, həm də qaz təzyiqi hesabına quyunun dibinə doğru hərəkət edir. Daban və yaxud kontur sularının mövcud olmasını müəyyən etməklə qazlı layın rejimini bilmək olmaz. Ona görə ki, sulu və qazlı yerlərin sərhəddində layın keçiriciliyi həddindən çox az, yaxud da lay qapalı ola bilər [3]. Belə olan hallarda qazın sıxışdırılması zamanı layın sulu hissəsinin rolu çox az olacaq. Lay sularının basqısı çox fəal olduğu zaman da çox vaxt lay qazın enerjisi hesabına istismar olunur. Bu hal, layın qazlı hissəsinin mayeyə görə faza keçiriciliyinin kiçik olduğu zaman və qazın istismarı zamanı sürət yuxarı olduğu halda baş verə bilər [3]. Nəticədə etibarilə bu vəziyyətdə layda mayenin sürəti təzyiqin sürətindən bir qədər az olur. Müxtəlif quyuların istismarı və əvvəlki hidrodinamik hesablamalar əsasında layda hansı işlənmə rejiminin baş verəcəyini bilmək mümkündür. Əgər hərəkətetdirici qüvvə yalnız sıxılmış qazın təzyiqindən ibarətdirsə, müəyyən vaxt ötdükcə qazlı hissənin əvvəlki həcmində dəyişiklik olmayacaq. Buna görə də burada təzyiq bir qədər az olacaqdır. Qaz quyusunun həcmindən, eyni zamanda istismar olunan qaza görə ortadakı layın təzyiqinin aşağıya doğru hərəkət etməsini "material balansı" ifadəsini işlədərək bilmək mümkündür. Quyuda əvvəlki halında görünən qazın çəkisi sonrakı vaxtda layın içində olan və istismar olunan qaz çəkisinin toplamına bərabər olur, yəni

$$\Omega O\gamma O = \gamma\Omega(t)+G2,0(t), \qquad (1)$$

burada, G2 - t zamanında laydan çıxarılan qazın ümumi çəki miqdarıdır;
ΩO – Əvvəlki halında yataqda qazla doymuş boşluqların birlikdə həcmidir;
Ω(t) - t vaxtına uyğun bir zamanda qazla doymuş boşluqların birlikdə həcmidir;
γO - İlk lay təzyiqi zamanı (pb) qazın xüsusi çəkisidir;
γ – növbəti orta lay təzyiqi zamanı (p) qazın xüsusi çəkisidir.
Daha sonra isə,

$$\gamma_0=\frac{P_b\,\gamma_{atm}}{P_{atm}\,Z_0} \text{ və } \gamma=\frac{P\,\gamma_{atm}}{P_{atm}\,Z} \qquad (2)$$

düsturunu istifadə edə bilərik. Burada Z0, Z—Pb və p təzyiqləri zamanı qazın sıxılmasının göstəriciləridir.

(1) və (2) düsturlarını nəzərə alaraq növbəti zamanda orta hissədə olan layın təzyiqi ilə laydan çıxan qazın miqdarı arasındakı münasibəti aşağıda verilən tənliklə əvəz etmək olar:
(2)

$$\bar{P}=\frac{Z}{\Omega}\left[\Omega_0\frac{\bar{P}_b}{Z_0}-Q_q(t)\right] \qquad (3)$$

burada Qq (t) - atmosfer təzyiqi ilə laydan çıxarılan qazın ümumi həcmidir.

$$Q_q(t) = G_q(t)\frac{1}{\gamma_{atm}};$$

$$\bar{P} = \frac{P}{P_{atm}};\ \overline{P_b} = \frac{P_b}{P_{atm}};$$


ISSN: 1609-1620, E-ISSN: 2674-5224
PAHTEI
REFEREED & REVIEWED JOURNAL

(3) tənliyini isə aşağıdakı şəkildə yazmaq olar:

$$Q_q(t) = \Omega_0 \frac{\bar{P}_b}{Z_0} - \Omega \frac{\bar{P}}{z} \qquad (4)$$

Hər hansı bir ifadə ilə yatağın qaz ehtiyatı hesablanarsa, bu hesablanmanın düzgün kəmiyyətlər alması üçün həmin ifadələrə daxil olan digər kəmiyyətlərin doğru hesablanması nəzərə alınmalıdır. Layda olan təzyiqin az da olsa yanlış ölçülməsi qaz ehtiyatının hesablanması zamanı çox böyük xətaya yol verə bilər. Bunun üçün də qaz quyuları tədqiq edildiyi zaman təzyiqi ölçərkən nümunəvi və ya çəki manometrlərindən istifadə etmək lazımdır. Qazın gün ərzində olan hasilatı, suyun və layın fiziki parametrləri nəzərə alınmaqla suyun qazın yatağı boyunca hərəkət etməsini hesablamaq mümkündür. Araşdırmalar apararkən qazlılıq konturunun daha çox zaman müddətində az bir yolu qət etməsi aydın olarsa, o zaman lay rejimi təcrübi cəhətdən qazın xüsusiyyəti kimi nəzərə alına bilər. Qazlılıq konturunun məsafə qət etməsi müəyyən miqdara şatdıqda lay xüsusiyyəti su basqısı, ya da birləşmiş rejimdə olur. Qazın çıxarılması üçün istismar olunan quyuda əvvəldə aparılan ölçmələr sonucunda qaz və su mübadiləsinin irəliləməsinin sürətini qabaqcadan hesablamaq mümkündür. Lakin alınan tənlik dəqiq olmayacaqdır. Lay istismar edildiyi vaxtda "material balansı" düsturundan yararlanaraq, əldə olunan qeyri-dəqiq hesablamalara düzəlişlər vermək olar [5].

Qazın orta molekulyar kütləsi (Mor) verilmiş ifadə ilə hesablanır [5]:

$$M_{or} = 0{,}01(V_1M_1 + V_2M_2 + ... + V_nM_n) \qquad (5)$$

Burada $V_1, V_2, ...., V_n$ -komponentlərin mol qatılıqları (%-lə);
$M_1, M_2, ......, M_n$ – kəmiyyətlərin molekulyar kütlələrini ifadə edir.
Əgər digər qaz qarışığı olan təbii qazın faizlə ifadə olunmuş kütlə tərkibi məlum olarsa, o zaman

$$M_{or} = \frac{100}{\frac{y_1}{M_1} + \frac{y_2}{M_2} + \frac{y_n}{M_n}} \qquad (6)$$

burada $y_1, y_2, ..., y_n$ - kütlə qatılıqlarıdır (%-lə).
Əgər qazın molekulyar tərkibi $a_1, a_2, ..., a_n$ vahidin hissələri ilə verilərsə, o zaman

$$M_{or} = a_1M_1 + a_2M_2 + ... + a_nM_n \qquad (7)$$

Qazda sıxlılıq ($\rho_q$) ilə işarə olunur və kq/m$^3$ ilə hesablanır.

$$\rho = \frac{m_q}{V_q} \qquad (8)$$

Burada $m_q$ qazın kütləsi, $V_q$ isə qazın həcmidir. Yanan qazların bəziləri havadan yüngül, bəziləri isə havadan ağırdır [4].
Təbii qazların sıxlıqları onların təzyiqinin və temperaturunun dəyişməsi ilə müəyyən miqdarda fərqlənə bilər. Ona görə də qazın sıxlığı barədə informasiya verərkən təzyiqin və temperaturun dəyişməsi haqqında məlumat göstərilməlidir. Bu məlumat qeyd olunmazsa sıxlığın standart məlumatlarının qeyd olunması deməkdir [10].

$$\rho_q = \rho_{q1} \frac{PT_1 . Z_1}{P_1 \, T . Z} \quad (9)$$

burada P və $P_1$ ; T və $T_1$ ; Z və $Z_1$ – qazın mütləq təzyiqi, mütləq temperaturu və sıxılmsını göstərən ifadələrdir..
Müəyyən vəziyyətdə Avaqadro ifadəsinə görə görə qazın sıxlığını ($r_{q.o}$) aşağıdakı düsturla ifadə edə bilərik:

$$\rho_{q.o} = \frac{M}{22,4} \quad (10)$$

Qaz qarışığı üçün sıxlığı ($r_{qar}$) additivlik qaydasına görə də hesablamaq olar. Bu zaman qarışığın komponentlərinin sıxlıqlarının ($r_1$, $r_2$ ,......, $r_n$) həmin komponentlərin həcmi hissələrinə ($a_1$, $a_2$ ,. , $a_n$) hasillərini cəmləmək lazım gəlir [3, 10].

$$\rho_{q.qar} = a_1 \rho_1 + a_2 \rho_2 + ... + a_n \rho_n \quad (11)$$

Qazda nisbi sıxlıq (D) qazın və qarışıqlarının sıxlığının ($r_q$) quru havanın ($r_h$) sıxlığına bölünməsidir ($r_k$ = 1,293 kq/m$^3$).

$$\Delta = \frac{\rho_q}{\rho_h} = \frac{\rho_q}{1,293} \quad (12)$$

Qazda nisbi sıxlıq D > 1 olarsa – havadan ağır, D < 1 olarsa havadan yüngül olduğu deməkdir. Bu məlumatın dəqiqləşdirilməsi ekoloji cəhətdən və təhlükəsizlik baxımından mühümdür [2].

**Cədvəl 2.** Qazlarda olan nisbi sıxlıq

| Qaz | Nisbi sıxlıq, D | Qaz | Nisbi sıxlıq, D |
|---|---|---|---|
| Metan Etan PropanButan | 0,55<br>1,037<br>1,52<br>2,004 | Karbon<br>Kükürd<br>Azot<br>Helium | 0,519<br>1,190<br>0,97<br>0,137 |

$$\upsilon_q = \frac{1}{\rho_q} = \frac{V_q}{M_a} \quad (13)$$

Təbii qazın xüsusiyyətlərini ifadə edən müəyyən göstəriciləri, yəni, həcmi, təzyiqi və temperaturu kəmər ilə hərəkət etdiyi vaxt fərqlənə bilər. Həmin göstəricilərdən biri digərindən asılıdır. Həmin asılılıq “qazın hal tənliyi” kimi adlandırılır [9].
Yuxarıda qeyd olunan tənliklərə keçməmişdən əvvəl onların mikroskopik, eyni zamanda makroskopik xüsusiyytələrini, bu xüsusiyytələrin müxtəlif, həm də ədədi qiymətcə birinin digərindən asılı olmasını vurğulamaq gərəklidir. Qazın temperaturunun, təzyiqinin, özlülüyünün, və istilik keçirməsinin makroskopik xüsusiyyəti ilə əlaqədar olmasını, eyni zamanda sürətinin, molekulların kinetik enerjisinin isə mikroskopik xüsusiyyəti ilə əlaqədar olmasını diqqətə almaq lazımdır.


ISSN: 1609-1620, E-ISSN: 2674-5224
PAHTEI
REFEREED & REVIEWED JOURNAL

Qazın qiymətini hesablamaq üçün hal tənliyini makroskopik cəhətdən "Mendeleyev-Klapeyron" ifadəsi ilə hesablamaq mümkündür. Qeyd etmək lazımdır ki, bu ifadəni

$$PV = mZRT \quad (14)$$

kimi hesablamaq olar:
ifadədəP, V, T, və m –ardıcıl şəkildə təzyiq, həcm, temperatur və kütlədir; R qazın sabiti, Z isə qazın sıxılma göstəricisidir.
(14) ifadəsinə aid qaz sabiti (R) qazda olan molekulyar kütləyə (M) və universal qaz sabitinə ($\bar{R}$)görə təyin olunur.

$$R = \bar{R}/M \quad (15)$$

Qazın sabit qiyməti olan R -in xüsusiyyətləri universal qaz sabiti $\bar{R}$ -lə eynilik təşkil edir.

Qazda olan komponentlər bilindiyi təqdirdə qazların qarışıq qiymətləri üçün sabiti

$$R = a_1R_1 + a_2R_2 + ... + a_nR_n \quad (16)$$

kimi olar.
Burada $a_1$, $a_2$, $a_n$ - komponentlərdə olan kütlələrin tərkibi,; $R_1$, $R_2$, $R_n$- isə qazın sabit göstəriciləridir.

**Nəticə**
Boruların hidravliki təyin olunmasını həmin boruda təbii qazın irəliləmə xüsusiyyəti ilə müşayiət olunan forma üçün aparmaq mümkündür. Qeyd etmək lazımdır ki, qazların belə irəliləmə xüsusiyyəti müəyyən təcrübi işlərin həyata keçirilməsində, həmçinin qaz borularının müasir standartlara uyğun olaraq təyin olunmasının aşkar edilməsində istifadə edilir.

$$\frac{d(pw^2)}{dx} = -\frac{dp}{dx} - \rho g\frac{dz}{dx} - \Lambda\frac{pw^2}{2D} \quad (18)$$

$$\frac{d(pw^2)}{dx} = 0 \quad (19)$$

r- qazda olan sıxlıq, w - qazın boruda sürəti ( $\frac{m}{s}$ ); x -kəmərin oxu və qazların irəliləməsiə ilə eyni

olan istiqamətdə olan koordinatdır; z –hündürlüyü; l - hidravliki müqavimətin əmsalını; D isə kəmərin diametrini ifadə edir (D=const).
(19) -dən göründüyü kimi, rw = const.
Onda,

$$d = (rw^2) = r\ w\ d\ w = rdw^2/2 \quad (20)$$

ifadə etmək mümkündür.
Belə olduğu təqdirdə (14) ifadəsini

$$-dP = \rho \Lambda \frac{dx}{D}\frac{w^2}{2} + \rho g dz + \rho d\frac{w^2}{2} \qquad (21)$$

şəklində qeyd etmək mümkündür.
Sonda qeyd olunan düsturla bildirilir ki, boruda təzyiqin aşağı enməsi sürtünnməyə səbəb olur.. Yuxarıda göstərilən ifadə hidravliki ölçmə işlərini yerinə yetirmək məqsədi ilə istifadə olunan birinci ifadə kimi qəbul edilir. Məhz bunun üçün də kəsilməzliyi göstərən ifadənin və hal tənliyinin qeyd olunan formalarından yararlanmaq lazımdır:

$$F \times r\, w = M \qquad (22)$$

$$P/r = ZRT \qquad (23)$$

burada $F$ – kəmərin sahəsi; $M$ - kütlənin sərfini göstərən ifadədir.

Bunu nəzərə alaraq (22) və (23) düsturlarına uyğun olaraq (20) düsturundan r = P/(ZRT ) və w=MZRT/(FP) olduğunu nəzərə alsaq, həmçinin rgdz@0 kimi qəbul etsək alarıq:

$$-PdP = \frac{M^2\ ZRT}{2F^2}\left(\Lambda\frac{dx}{D} - 2\Lambda\frac{dP}{P}\right)$$

Sonuncu qeyd olunan ifadəni inteqrallasaq,

$$P_b^2 - P_s^2 = \frac{M^2\ ZRT}{2F^2}\left(\Lambda\frac{L}{D} + 2\ln\frac{P_b}{P_s}\right)$$

alarıq
burada, $P_b$ başlanğıc təzyiq, $P_s$ isə son təzyiqdir;
L –borunun hesablana bilən kəsiminin göstəricisidir.
Boruların istismara verilməsinin qəbul edilmiş normaları əsasında borunun trasının xüsusiyyətləri start xəttini nəzərə alaraq 200 metrdən çox fərq yaradarsa hesablanma aparılarkən bu diqqətdə saxlanılmalıdır.
Sahələrin xüsusiyyətlərini nəzərə alaraq mikrorelyeflərin olmadığını düşünsək

$$-PdP = \rho\Lambda\frac{dx}{D}\frac{w^2}{2} + \rho g dz \qquad (24)$$

tənliyini alarıq.
Bu ifadə ilə birlikdə hal tənliklərindən birini də yazsaq,

$$P/\rho = zRT \text{ və } w = \frac{4\,M}{\pi D^2\,\rho} = \frac{4\,MZRT}{\pi D^2\,P}$$

alarıq,

$dz=\frac{dz}{dx}$ dx və ya $dz=\frac{\Delta z}{l}$ dx ( (mail boru kəmərləri üçün $\frac{dz}{dx} = \frac{\Delta z}{l}$) olduğundan

əvəzləmələrini aparsaq, həmçinin (6)-nı P-yə vursaq




$$-dP^2 = (M^2b + a\frac{\Delta z}{\Delta l} P^2)dx \quad (25)$$

nəticəsini alarıq [7, 8].

**ƏDƏBİYYAT**

1. Iskandarov E.X., Ismayilov Q.Q., Seyfullayev Q.H., Ismayilov R.A., Ismayilova F.B., Huseynov A.C., Mirzayev V.H. Qaz kamarlarinin texnoloji vaziyyatinin diaqnostikası uzra metodik rahbarlik. – Baki: Elm nashriyyati, 2017. – 38 s.
2. Gurbanov H., İskandarov E., Karimova A. Qazin naql xatlarinda faza chevrilmalari va qazin qurudulmasi prosesinin arashdirilmasi //AzTU Elmi asarlar, c. 1, No3, Bakı, 2016, s.24-29.
3. Dogan, M. Enerji Kullaniminin Cografi chevre uzerindeki etkileri, Marmara Cografya dergisi, İstanbul, 2011. Sayı:23, Sayfa:35-52,.
4. American Petroleum Institute. (2013), API Standard 1104,Welding of Pipelines and Related Facilities.
5. Cherri YU., Shashchvan M., Giu K. i dr. Predotvrashcheniye postupleniya peska iz plasta v skvazhinu // Neftegazovyye tekhnologii. 2009. No12. s.5-9
6. Seaid M. High-resolution relaxation scheme for the two-dimensional Riemann problems in gas dynamics. Numerical Methods for Partial Differential Equations 2012; 22 :397–413.
7. Morshed, M., Amin, A., Rahman, M. A., & Imtiaz, S. (2016, July). Experimental and computational analysis of pressure response in a multiphase flow loop./ In M. Ali, M. A. S. Akanda, & A. M. Morshed (Eds.), AIP Conference Proceedings .-Vol.1754, No. 1, p. 040010. AIP Publishing.
8. https://www.api.org/oil-and-natural-gas/wells-to-consumer/transporting-oil-natural-gas/pipeline/where-are-the-pipelines
9. https://studfile.net/preview/8926344/page:21/
10. https://www.eia.gov/energyexplained/natural-gas/natural-gas-pipelines.php

# ИССЛЕДОВАНИЕ ТЕЧЕНИЯ ГАЗА В МЕТАЛЛИЧЕСКОЙ ТРУБЕ

**Камал Набиев**
BP Caspian Exploration, техник ЦДУ добычи, докторант. Email: nebiyevkamal@gmail.com,

**РЕЗЮМЕ**

Газы являются основными энергоносителями в качестве топлива и состоят из смеси легких (метан, этан, пропан, бутан), тяжелых углеводородов (пентан, гексан, гептан и др.) и неуглеводородных газов.
К природным газам относятся газ, газоконденсат и газ, добываемый на нефтяных месторождениях.

Газы, извлеченные из месторождений чистого газа, считаются сухими газами. Большая его часть состоит из метана. Низкая температура горения этих газов колеблется в пределах 31000-38000 кС/м3.
Газы, получаемые с газоконденсатных месторождений, состоят из сухих газоконденсатных смесей (бензин, лигнин, керосин).
Сухие газы, в том числе газовые бензиновые и пропан-бутановые фракции, относятся к попутным газам, образующимся вместе с нефтью нефтепромыслов [1].
Низкая температура горения газов колеблется в пределах 38000-63000 кС/м3.
В зависимости от количества тяжелых углеводородов (пропан и др.) природные газы подразделяются на сухие (менее 50 г/м3), газы средней категории (50-150 г/м3) и нефтяные (более 150 г/м3).

**Ключевые слова:** природный газ, кризисная температура, металлические трубы, плотность газа, залежи газа.

Publication history

Article received: 29.08.2022
Article accepted: 07.10.2022
Article published online: 22.10.2022
DOI suffix: 10.36962/PAHTEI21102022-81

E-ISSN: 2674-5224

91-100 VOLUME 21 ISSUE 10 2022



ISSN: 1609-1620, E-ISSN: 2674-5224
P A H T E I
REFEREED & REVIEWED JOURNAL

# INFLUENCE GROUNDWATER PRODUCTION AND EXPLOITATION ON ECOSYSTEM CHANGING IN AZERBAIJAN

**Mehriban Ismailova**
ASOIU, Department of Industrial Safety and labor protection, PhD, E-mail: mexribani@inbox.ru

## ABSTRACT

The Azerbaijan Republic is located in the arid climatic zone and due to this feels deficit of general water balance. The production and utilization of the groundwater caused negative consequences that affected on natural conditions of different regions. For example, in Qanikh-Ayrichay fields we can notice abnormally high hydraulic interrelation between ground and surface waters, and underground component of the river drain in the natural conditions forms approximately 55-65%. When infringing given conditions by production the groundwater the decrease of their average level forms approximately 50-60 meters. The appeared depression funnels cause tightening of the additional volume of river run-off to the groundwater intake wells, that is damage river run-off. Given volume of the river run-off must not be calculated twice when assessing the common water balance of the region. And another fact, the decrease of the groundwater level in a part of Gusar region has created some ecological problems. In the region of development of the relict forests the dynamic levels of the groundwater decreased on 25-30 meters. This affected root-inhabitable stratum and as a result led to abrupt aggravation of the ecological situation of the regions. It was required to optimize the production of the groundwater. Opposite situation is observed in the Absheron Peninsula where there are almost no fresh water resources. The water demands are met by surface water resources of Samur river and groundwater transfer from Guba-Gusar region of the Republic (more than 200 km from the demand areas). These sources are augmented with water from Kura river in the Ali-Bayramli region (more than 180 km from the demand area), at rates of up to 30 m'/sec. Due to the specific hydrogeological conditions, absence of sewerage system and etc., it leads to land subsidence, landslide processes, flooding, and other environmental and social phenomena and abrupt aggravation of the geoecological situation of the peninsula, in the whole. As it has already been mentioned a big part of groundwater in Azerbaijan is utilized for irrigation of agricultural crop. Mostly we notice fresh (up to1.0 g/l) or weakly saltish (up to 3.0 g/l) hydrocarbonate-sulphate and sulphate - hydrocarbonate waters with different cationic composition. The combination of cations form irrigation factors of the groundwater and as a result forms opportunity to utilize it for irrigation of concrete soils. Incorrect calculation of given qualitative parameters in the "water-rock" system has led to salinization of the soils of irrigated areas of Mil and Mugan-Salyan plains and accordingly led them to exit from the crop rotation. At present time, melioration of these areas is realizing. Thus, we can certify that production and utilization of the groundwater is essential anthropogenic factor, which influence on geoeco-logical situation of the republic. This factor must be taken into account when forecasting water-related activities in the whole and concerning exploitation of the groundwater, in particular.

**Keywords:** water-bearing horizons, aquifer, water-saturated series, water-economy balance, gravel-pebble sedimentation, depression funnel, Mil and Mugan-Salyan plains, exploitative reserves.

ISSN: 1609-1620, E-ISSN: 2674-5224
PAHTEI
REFEREED & REVIEWED JOURNAL
E-ISSN: 2674-5224
VOLUME 21 ISSUE 10 2022

## Introduction

In this area rational exploitation of fresh and weakly saltish groundwater has great importance. Groundwater fields are the Quaternary water-bearing series of foothill and intermountain plains, which are unevenly distributed through the territory of the republic, and their exploitation reserves are not equal as well. In all, 11 fields with general exploitation reserves 14.2 mln. $m^3$/day of fresh and weakly saltish groundwater are utilized and approximately 49% of them were utilized during the most intensive exploitation period (2000-2008). However, in some fields (Karabagh, Mil, Jabrail) the volume of annual production has reached 85-95% of approved reserves. The most part of the produced groundwater (up to 90%) is used for irrigation of agricultural crops and only 10% is used for centralized and decentralized supply of the settlements with fresh water and for industrial-technical needs.

## Objective

The production and utilization of the groundwater caused negative consequences that affected on natural conditions of different regions. These consequences are classified according to two signs:
-processes related with increase and decrease of the groundwater level;
-processes related with interrelation of quality parameters of the "water-rock" system. The water-saturated series of foothill plains are composed of aquifer and some (usually 3-4) confined waters, hydraulically interrelated with each other. In addition, piezometric surface of the underlying horizons exceed heads of the overlying ones (owing to uniform area of feeding) and as a result, the unloading occurs from bottom to top. Reservoirs are gravel-pebble deposits with a lot of sandy inclusions, as well as different-grain sands. As a rule, coefficients of their filtration vary within 5-15 m\day, sometimes up to 25-30 m\day. During the production of groundwater by the water-wells all the aquifer and confined water are actually utilized (owing to their hydraulic interrelation). Therefore, their weighted-average levels are accepted in calculations (Figure1).




**Figure 1.** The basic scheme of formation and expenditure of stratum – pore groundwater of foothill plains: 1-upper boundary of the system, 2-groundwater runoff and interflow streamline, 3-Regional drains ( Kur. Araz, Ganikh-Ayrichay rivers, sea), 6 - atmospheric and surface water infiltration, 7- groundwater level, 8- pressure gradient, 9- groundwater run-off zone.

